# Giriş

İman edənləri qaranlıqlardan nura çıxardan, qullarına qarşı çox şəfqətli və mərhəmətli olan, əl açıb ona yalvaranların duasını qəbul edən, gizli və aşkarda olan nə varsa hər şeyi incəliklərinə kimi bilən və xəbərdar olan, qullarına zülm etməyən və ədalət sahibi olan, doğmayıb və doğulmayan, eşidən və görən, aləmlərin Rəbbi və tək ilahı olan Allaha sonsuz həmdlər olsun. Allaha və axirət gününə ümid bəsləyənlər və Allahı çox zikr edənlər üçün gözəl örnək olan, aləmlərə rəhmət olaraq və gözəl əxlaqı tamamlamaq üçün göndərilən, möminlərə qarşı çox şəfqətli, kafirlərə qarşı isə çox sərt olan, Allahın və mələklərinin salavat gətirdikləri Allahın qulu və elçisi Muhəmmədə salat və salam olsun!

Uca Allah Qurani-Kərimdə buyurmuşdur:

***«Mühacir və ənsarlardan (iman etməkdə) ilk olub önə keçənlər və onlara gözəl şəkildə tabe olanlara gəlincə, Allah onlardan razıdır, onlar da Allahdan razıdılar. (Allah) onlar üçün içində əbədi qalacaqları, (ağacları) altından çaylar axan cənnətlər hazırlamışdır. Bu, böyük qurtuluşdur.»***

**(Tövbə, 100)**

Alimlər ayədə keçən ***"onlara gözəl şəkildə tabe olanlar"*** sözündə qəsd olunanların tabiînlər olduğunu bildirmişlər. Tabiîn (تابعين) ərəbcədə tabe olan mənasına gələn tabiî (تابعي) sözünün cəmidir və peyğəmbəri (sallallahu aleyhi və səlləm) görməyən, lakin səhabəni görən və iman edən müsəlmanlara deyilir. Hafiz İbni Hacər (Allah ona rəhmət etsin) demişdir:

“Tabiî səhabə ilə qarşılaşan kimsədir.”[1]

Allah subhanəhu təala ayədə səhabələrə gözəl şəkildə tabe olanlardan razı olduğunu və onlara cənnətlər hazırladığını bildirmişdir. Buna görə də səhabələrin yoluna tabe olanları tanımaq və onları nümunə almaq Allahın rizasını arzulayan hər bir müsəlman üçün əhəmiyyətlidir. Çünki onlar səhabələrdən sonra Allahın dinini ən gözəl şəkildə bilən və yaşan insanlar idilər.

Həmçinin Allah azzə və cəllə başqa bir ayədə bu cür buyurmuşdur:

***«(Səhabələrdən) sonra gələnlər deyirlər: "Ey Rəbbimiz! Bizi və bizdən əvvəlki iman gətirmiş qardaşlarımızı bağışla. Bizim qəlbimizdə iman gətirənlərə qarşı nifrət və həsədə yer vermə. Ey Rəbbimiz! Həqiqətən də, Sən şəqətlisən və rəhimlisən."»*** **(Həşr, 10)**

Allah Rəsulu (sallallahu aleyhi və səlləm) hədisdə buyurmuşdur:

**“İnsanların ən xeyirliləri mənim zamanımdakılardır. Sonra isə onların ardınca gələnlər, sonra yenə onların ardınca gələnlərdir.”[2]**

İmam Nəvəvi (Allah ona rəhmət etsin) həmin hədisin şərhində demişdir:

“Doğru olan budur ki, peyğəmbərin (sallallahu aleyhi və səlləm) zamanındakılar səhabələrdir. İkincilər isə tabiînlərdir, üçüncülər isə onlara tabe olanlardır.”[3]

---

[1] "Nuxbətu əl-Fikər, 4/724"

[2] "Səhihu-Buxari, (3651)"; "Səhihu-Muslim, (2533)"

[3] "Şərhu Muslim, 16/85"

Hafiz İbni Hacər isə demişdir: “**(Sonra isə onların ardınca gələnlər) –** yəni onlardan sonrakı zamanın insanlarıdır, onlar isə tabiînlərdir. (**sonra yenə onların ardınca gələnlər**) – onlar da tabiînlərə tabe olan ətbaû ət-tabiînlərdir.”

Səhabələr Allah Rəsulunu gördülər, Quran ayələrinin nazil olmasına səbəb olan hadisələrə şahid oldular. Buna görə də Allahın kəlamını ən gözəl şəkildə anlayan və Peyğəmbərimizin yolunu ən düzgün şəkildə bilən onlar idi. Səhabələr Quranın və peyğəmbərimizin (sallallahu aleyhi və səlləm) Sünnəsini həyatlarında yaşayan canlı nümunələr idilər. Allahın kəlamını və peyğəmbərin sözünü sonrakı insanlara onlar çatdırdılar. Buna görə də onlar insanların ən xeyirli nəsli oldular. Daha sonra isə Quranı və Sünnəni ən doğru şəkildə anlayan və yaşayan, səhabə nəslini görən və dini onlardan öyrənib insanlara çatdıran tabiîn nəsli gəldi. Onlar səhabələrdən peyğəmbərimizin (sallallahu aleyhi və səlləm) hədislərini rəvayət etdilər, səhabələrin görüşlərini və ictihadlarını sonrakı nəsillərə bildirdilər. Buna görə də onlar səhabələrdən sonra insanların ən xeyirliləri idilər və Allahın razı qaldığı insanların zümrəsinə daxil oldular. Məhz Allahın Kitabını və peyğəmbərinin Sünnəsini doğru anlayış üzərinə anlamaq və Allahın razı qaldığı insanlardan olmaq istəyən hər bir müsəlmanın bu xeyirli nəsli özünə örnək alması gərəkir.

Bunu göz önündə tutaraq tabiînlər içərisində xüsusi sevgiyə və məqama sahib olan, “zahidlərin sultanı” və “tabiînlərin əfəndisi” kimi adlandırılan Həsən əl-Bəsrinin həyatını, onun sözlərindən ibarət inciləri və hikmətləri toplayaraq oxuyucularla paylaşmağı və bununla onu örnək almaq istəyən müsəlman qardaşlarımıza və bacılarımıza bu işdə kömək edəcək faydalı bir iş görməyi qərara aldım.

Burada Həsən əl-Bəsrinin sözlərindən ibarət seçib hazırladığım rəvayətləri 11 fəslə ayırdım. Bunlar aşağıdakılardan ibarətdir:

**Birinci fəsil:** Həsəni əl-Bəsrinin həyatı, xarakteri və onun haqqında deyilmiş sözlər

**İkinci fəsil:** Elm və alimlərin fəziləti haqqında dediyi sözlər

**Üçüncü fəsil:** Gözəl əxlaqi dəyərlər və bəzi ədəblər haqqında dediyi sözlər

**Dördüncü fəsil:** Yaxşı əməl sahiblərinin sifətləri və bəzi saleh əməllər haqqında dediyi sözlər

**Beşinci fəsil:** Qardaşlıq sevgisi haqqında dediyi sözlər

**Altıncı fəsil:** Dünyanı pisləməsi və ona bağlanmaqdan çəkindirməsi haqqında dediyi sözlər

**Yeddinci fəsil:** Günahlar və bəzi çirkin işlərdən çəkinmək haqqında dediyi sözlər

**Səkkizinci fəsil:** Ölümü, cəhənnəm atəşini xatırlamaq və nəfsi hesaba çəkmək haqqında dediyi sözlər

**Doqquzuncu fəsil:** Quran oxumaq və bəzi ayələr haqqında dediyi sözlər

**Onuncu fəsil:** Əmirlər və hakimlər haqqında dediyi sözlər

**On birinci fəsil:** Müxtəlif mövzularda etdiyi nəsihətlər və danışdığı hikmətlər

Uca Allah bu faydalı əməyi bizdən qəbul etsin və bizləri insanların ən xeyirlisi olan üç fəzilətli nəslin imamlarına gözəl şəkildə tabe olanlardan etsin!

# Birinci fəsil: Həsəni əl-Bəsrinin həyatı, xarakteri və onun haqqında deyilmiş sözlər

***Həsən əl-Bəsrinin həyatı*[4]**

Onun adı əl-Həsən ibnu Əbil-Həsən Yəsar, künyəsi isə Əbu Səîd əl-Bəsridir. O, tabiînlərin böyüklərindən olub, Zeyd ibnu Sabit əl-Ənsarinin azad etdiyi köləsi idi. Zühd həyatı yaşayan, hədis rəvayət edən, fəqih, müfəssir və müsəlmanlara nəsihətlər edən hikmət sahibi birisi idi.

Atası Bəsrə ilə Vasıt arasında yerləşən Məysan adlı bölgənin fəthi zamanında əsir düşmüşdür. Ənsardan bir nəfərin[5] azad etdiyi köləsi olan Yəsar daha sonra Mədinədə məskunlaşmış və Ömərin (Allah ondan razı olsun) xilafəti zamanında Həsənin anası Xayra ilə evlənmişdir. Ömərin (Allah ondan razı olsun) xilafətinin son iki ilində, yəni hicrətin 21-ci ilində isə Həsən dünyaya gəldi.

Həsənin anası Xayra peyğəmbərimizin (sallallahu aleyhi və səlləm) zövcəsi, möminlərin anası Ummu Sələmənin xidmətində olan azad etdiyi köləsi idi. Həsən Ummu Sələmənin qucağında böyümüşdür. O, Xayranı bəzi ehtiyaclardan ötrü göndərərdi və həmin vaxt Həsən ağlayardı. Ummu Sələmə onu sakitləşdirmək üçün qucağına alardı və onu əmizdirərdi. Onu bir neçə dəfə əmizdirdiyi

---

[4] Həsən əl-Bəsrinin həyatı haqqında daha geniş məlumatlar üçün bu qaynaqlara müraciət edilə bilər: "Siyəru Ə'lamu ən-Nubəla, 4/563"; "Tabaqat İbnu Sád, 7/156"; "əz-Zühd li İmam Əhməd, s.258"; "Hilyətu əl-Əvliya, 2/131"; "Təhzibu əl-Kamal, 6/95"; "əl-Bidayə va ən-Nihayə, 9/266"

[5] Onun Cəmil ibnu Qutbə olduğu deyilmişdir. (Bax: "Siyəru Ə'lamu ən-Nubəla, 4/564")

rəvayət edilmişdir.[6] Həsənin irəlidə sahib olacağı hikmət və bəlağətin, zühd və təqvanın bundan dolayı olduğunu demişlər. Həmçinin möminlərin anası Ummu Sələmə Həsən balaca ikən onu Rəsulullahın (sallallahu aleyhi və səlləm) səhabələrinin arasına çıxardardı və onlar da onun üçün dua edərlərdi. Bir dəfə onu Ömərin (Allah ondan razı olsun) yanına apardı və o, da bu cür dua etdi:

“Allahım! Onu dində fəqih et və onu insanlara sevdir.”[7]

Həsən Hicazda yerləşən Vadi əl-Qura adlı yerdə böyümüş və uşaqlığını orada keçirmişdir. Orada səhabələrin arasında yaşamış və onların böyüklərindən hədis dinləmişdir. Xəlifə Osman ibnu Affanın (Allah ondan razı olsun) qıldırdığı cümə namazlarına gedərdi və onun xütbələrini dinləyərdi. Osmanın şəhid edildiyi günə şahid oldu və həmin vaxt o, on dörd yaşında idi.

Hicrətin 37-ci ilində Həsən Bəsrəyə köçür və orada qalan səhabələrdən elm öyrənir. Hicrətin 43-cü ilində isə Xorasanın fəthinə qatılır və orada əmir Rabî ibnu Ziyad əl-Harisin katibliyini edir. Döyüşdən döndükdən sonra isə Bəsrəyə yerləşir, orada elmlə və ibadətlərlə məşğul olur. Hətta o, Bəsrənin ən məşhur alimlərindən və zahidlərindən birinə çevrilir.

Alimlər Bəsrə camaatı üçün tabiînlərin ən fəzilətsinin Həsən əl-Bəsri olduğunu bildirmişlər. Xəlifə Ömər ibni Abdulaziz onu tabiînlərin əfəndisi adlandırmışdır.

Səhabələrin böyüklərindən Osman, Nûman ibni Bəşir, Cabir ibni Abdullah, İbni Abbas, Ənəs ibni Malik, Talha və s. kimi bir çox

---

[6] Bax:"Hilyətu əl-Əvliya, 2/137"

[7] əz-Zəhəbi "Siyəru Ə'lamun-Nubəla, 4/565"-də rəvayətin isnadının mursəl olduğunu bildirmişdir.

səhabələri görmüş və onların bir çoxlarından hədis rəvayət etmişdir.

Həsən əl-Bəsri hicrətin 110-cu ilində, 88 yaşında Bəsrədə vəfat etmişdir. Cənazəsinə o qədər çox insan qatılmışdı ki, deyilənə görə ilk dəfə Bəsrə camisi bu səbəblə boş qalmışdır. Allah rəhmət eləsin!

***Onun ilə eyni dövrdə yaşamış sələfin sözləri:***

* Rəvayət edilir ki, bir gün Aişə (Allah ondan razı olsun) Həsən danışarkən onu eşidir və deyir:

"Siddiqlərin sözü ilə danışan bu adam kimdir?"

* Əli ibni əl-Hüseynə[8] (Allah hər ikisindən razı olsun) Həsənin bu cür söylədiyi deyildi:

"Həlak olanın necə həlak olduğu təəccüblü bir şey deyil. Təəccüblü olan yalnız qurtulanın necə qurtulmasıdır."

Əli dedi: "Sübhənallah! Bu, siddiqin sözüdür."

* əl-Ə'maş[9]ın bu cür dediyi rəvayət edilir:

"Həsən hikmətə o qədər əhəmiyyət verərdi ki, hətta danışarkən onunla danışardı."

[8] O, Əhli beytdən olub, Əli ibnu Əbi Talibin oğlu Hüseyndən olan nəvəsidir. Hicrətin 38-ci ilində Mədinədə doğulmuşdur. Zeynəlabidin kimi tanınırdı. O, şiəlikdə dördüncü imam hesab olunur. Deyilənə görə Kərbala hadisəsində iştirak etmişdir, lakin xəstəliyi səbəbi ilə döyüşə qatıla bilməmişdir. Hicrətin 94-cü ilində vəfat etmişdir.

[9] O, Suleyman ibnu Mehran əl-Ə'maşdır. Hicrətin 60-cı ilində Kufədə anadan olmuşdur. Tabiînlərin kiçiklərindən olub 5-ci təbəqədə yer alır. Çox hədis rəvayət etmişdir və hədisdə güvənilən, etibarlı ravilərdən sayılır. Hicrətin 147-ci və ya 148-ci ilində vəfat etmişdir.

* Əbu Cafər əl-Baqir[10]in yanında Həsəndən danışılanda o bu cür deyərdi:

“Kəlamı peyğəmbərlərin kəlamına bənzəyən məhz odur.”

* Əbu Qatadə onun haqqında demişdir:

“Bu şeyxdən heç ayrılmayın. Ondan başqa görüşü Ömərin görüşünə bənzəyən kimsə görmədim.”

* Əbu Burdə[11] demişdir: “Muhəmmədin (sallallahu aleyhi və səlləm) əshabına Həsəndən daha çox bənzəyən birisini görmədim.”

* Ənəs ibnu Malik[12]dən bir məsələ barəsində soruşurlar. O isə bu cür cavab verir:

“Əfəndimiz Həsəndən soruşun.” Dedilər ki:

"Ey Əba Həmzə! Biz səndən soruşuruq sən isə deyirsən Həsəndən soruşun?" O isə dedi:

"Əfəndimiz Həsəndən soruşun. O, (elmi) dinlədi, biz də dinlədik.

---

[10] O, Əbu Cəfər Muhəmməd ibnu Əli əl-Baqirdir. Mədinədə dünyaya gəlmişdir və hicri 57-114-cü illərdə yaşamışdır. O, əhli-beytdəndir və Şiə inancında 5-ci imam kimi yer alır. Bir çox əhli-sünnə alimləri ondan hədislər rəvayət etmişdir.

[11] O, səhabə Əbu Musa əl-Əşârinin oğludur. Atası Bəsrədə vali olduğu vaxtlarda dünya gəlmişdir. Sonralar Kufənin fəqih tabiînlərindən və qazilərindən birisi olmuşdur. Başda atası olmaqla Əli ibnu Əbi Talib, Aişə, Əbu Hureyrə, İbni Ömər, Abdullah ibni Amr ibnu As və s. kimi bir çox səhabələrdən hədis rəvayət etmişdir. Hicri 103-cü ildə Kufədə vəfat etmişdir.

[12] O, səhabədir və adı Əbu Hamza Ənəs ibnu Malik ən-Nəccari əl-Xazrəcidir. Hicrətdən 10 il öncə Yəsribdə dünyaya gəlmişdir və peyğəmbərimizə (sallallahu aleyhi və səlləm) 9 il xidmət etmişdir. Peyğəmbər (sallallahu aleyhi və səlləm) Mədinəyə hicrət edəndə onun 9 yaşı var idi. Anası Ummu Suleym onu, xidmət etməsi üçün peyğəmbərin yanına aparmışdır. Rəsulullahdan ən çox hədis rəvayət edən səhabələr arasındadır. Hicrətin 93-cü ilində vəfat etmişdir.

Lakin o, əzbərlədi, biz isə unutduq."

* Yenə Ənəs ibnu Malik demişdir: “Mən Bəsrə əhlinə bu iki şeyxdən dolayı qibtə edirəm: Həsən əl-Bəsri və Muhəmməd ibnu Sirin.”

* Süleyman ət-Teymi[13] onun haqqında demişdir: “Həsən döyüşə çıxardı, həmin vaxtlarda Bəsrənin müftisi Cabir ibnu Zeyd əbu əş-Şâsa idi. Sonra Həsən gəldi və müfti oldu.”

* Qatadə[14] demişdir: “Həsənin elmini alimlərdən hər hansı biri ilə bir araya gətirdimsə, Həsənin elminin mütləq onun üzərində bir fəzilətinin olduğunu gördüm. Yalnız əgər hər hansı bir şey ona anlaşılmaz gələrsə, Səîd ibnu Museyyəbə[15] yazar və ondan soruşar. Elə bir fəqih yoxdur ki, onunla oturduğum zaman mütləq onun üzərində Həsənin fəzilətini görməmiş olum.”

Yenə demişdir: “İnsanlar içərisində halal və haramı ən çox bilən Həsən idi.”

* Əyyub əs-Sixtiyani[16] demişdir: “Bir adam üç il Həsən ilə birlikdə

---

[13] O, Suleyman ibnu Tarxan ət-Teymidir. Bəsrəli tabiînlərdən olub hicri 46-143-cü illərdə yaşamışdır. Güvənilən və etibar edilən hədis ravilərindəndir.

[14] O, Qatadə ibnu Diâmə əl-Bəsridir. Hicri 61-118-ci illərdə yaşamışdır. Gözləri kor olsa da zamanındakı ən güvənilən tabiînlərdən və çox hədis rəvayət edən ravilərdən biri idi. Ənəs ibnu Malikdən və başda Həsən əl-Bəsri olmaqla bir çox tabiînlərin böyüklərindən hədis rəvayət etmişdir.

[15] Hicri 15-94-cü illərdə yaşamış Mədinədə yaşayan tabiînlərin böyüklərindən idi. Xəlifə Ömərin (Allah ondan razı olsun) xilafəti dövründə doğulmuşdur, Ömər ibnul Xattab, Osman ibnu Affan və Əli ibnu Əbi Talib kimi səhabələrlə görüşmüşdür. Əbu Hureyrənin (Allah ondan razı olsun) qızı ilə evlənmişdir. O, Mədinədəki tabiînlərin ən fəzilətlisi və yeddi fəqihdən biri idi. Zühd həyatını yaşayan və saleh bir kimsə idi. Tabiînlər içərisində ən fəqihi və müctəhidi idi. Səhabələrdən çoxlu hədislər rəvayət etmişdir.

[16] Tabiînlərin böyüklərindən idi. əz-Zəhəbi onun İbni Abbasın vəfat etdiyi hicrətin 68-ci ilində dünyaya gəldiyini bildirmişdir. Güvənilən hədis ravilərindəndir və səhabələrdən Ənəs ibnu Maliki gördüyü deyilir. əz-

oturdu, ancaq onun heybətindən bir məsələ barəsində belə sual vermədi.”

Yenə demişdir: “Əgər Həsəni görsəydin, (ondan öncə) heç vaxt fəqih birisi ilə oturmadığını deyərdin.”

* Həccac ibnu Ərtat demişdir: Âta[17]dan cənazənin üzərinə Quran oxumaq barəsində soruşdum. Dedi ki:

“Bu barədə nə bir şey eşitdik, nə də ki, bir şey bilirik.” Dedim ki, Həsən oxunacağını söyləyir. Dedi ki:

“Onun sözündən yapış. Həqiqətəndə o, örnək alınacaq böyük bir imamdır.”

* Avf onun haqqında demişdir: “Cənnətin yolunu Həsəndən daha çox bilən bir adam görmədim.”

* Əbu Hilal dedi: Qatadənin yanında idim Həsənin ölüm xəbəri gəldi. Dedim ki, o, elmin içərisinə dalmış birisi idi. Qatadə isə dedi:

“Əksinə onun içərisində yetişdi, onu mənimsədi və içinə çəkdi.

---

Zəhəbi onun hicrətin 131-ci ilində 63 yaşında Bəsrədə vəfat etdiyini bildirmişdir.

[17] Onun Âta ibni Əbi Rəbahmı yoxsa Âta ibni Yəsarmı olmasından əmin deyiləm. Hər ikisi də tabiîlərdən idi.

Âta ibni Əbi Rəbah hicri 27-114-cü illərdə yaşamışdır. Əslən Yəmənli idi, Məkkəyə kölə olaraq gətirilmiş sonradan azad edilmişdir. Fəqih və hədis alimi idi, möminlərin anası Aişə anamızdan (Allah ondan razı olsun), Əbu Hureyrə, İbni Abbas, İbni Ömər və s. səhabələrdən (Allah onların hamısından razı olsun) hədis rəvayət etmişdir. Həmçinin bir çox tabiînlərin böyüklərindən də hədis rəvayət edib. O, eyni zamanda Məkkənin müftisi idi.

Âta ibni Yəsar isə hicri 29-103-cü illərdə yaşamış Mədinəli tabiînlərdəndir. Mədinədə xəlifə Osmanın zamanında doğulmuşdur. O, möminlərin anası Meymunə bintu əl-Harisin azad etdiyi köləsi idi. Aişə anamızdan, Əbu Hureyrədən, Zeyd ibni Sabit, Usamə ibni Zeyd və s. səhabələrdən hədis rəvayət etmişdir. Həmçinin zamanının böyük tabiînlərinin bir çoxundan hədis rəvayət etmişdir. Güvənilən hədis ravilərindən hesab olunur.

Vallahi, Haruridən[18] başqası ona nifrət etməz.”

* Hişam ibnu Hassan[19] onun haqqında demişdir: “Həsən öz zamanındakı insanların ən cəsuru idi.”

* Humeyd və Yunus demişdir: “Həsəndən daha kamil mürüvvətə[20] sahib birisini görmədik.”

* Əbu Hilal dedi: “Həsənin saqqalını sarı rəngə boyadığını gördüm.”

* əl-Əsmaî atasının bu cür dediyini rəvayət etmişdir: “Həsənin dirsəyindən daha geniş bir dirsək görmədim. Onun genişliyi bir qarış idi.”

***Həsənin xarakterinə dair deyilmiş digər sözlər:***

* Həsən daima hüzünlü, çox ağlayan, saxtakarlıqdan uzaq olan, öz nəfsi üçün gerçəkləri istəyən birisi idi. Üzərində açıq bir şəkildə görsənsə də yaşadığı zühd həyatını ortaya çıxarmazdı. Yaraşıqlı görsənməyi tərk etməz, gözəl paltarlar geyinməkdən imtina etməzdi. İnsanlarla birlikdə yemək yeməkdən geri qalmaz, yeməyə dəvət edənin çağırışına gecikməzdi. Öncədən onu görməyən birisinin onunla qarşılaşanda onu tanıyacağı bir simaya malik idi.

---

[18] Haruriyyə xəvariclərin bir firqəsi olub xəlifə Əli ibni Əbi Talib (Allah ondan razı olsun) zamanında ondan ayrılan və Kufədə Hurura adlanan bir bölgədə toplaşan azmış tayfanın adıdır. Onlar Əlini (Allah ondan razı olsun) və digər səhabələri, böyük günah işləyən hər bir müsəlmanı təkfir etməklə tanınırlar. Onlar, İslamda ortaya çıxan ilk bidət tayfası idi. Həsən əl-Bəsri onlara qarşı çox sərt idi və buna görə də onu sevməzdilər.

[19] O, Bəsrəli alimlərdən və hədis ravilərindən idi. Tabiînlərin böyüklərindən hədis rəvayət etmişdir. Hicri 146 və ya 147-ci ildə vəfat etmişdir.

[20] Mürüvvət: mərd adama və həqiqi insana xas olan yaxşı sifətlərdir; rəhm, insaf, mərhəmət, insanlıq və s. kimi

* İbnu Şəvzəb dedi ki, Həsən əl-Bəsri demişdir:

“(Xəlifə) Osmanın qətl edildiyi gün mən on dörd yaşında idim.”

* Həsənin dostu Abdulvahiddən soruşuldu: “İçərinizdə (başqa) alimlər və fəqihlər olduğu bir halda Həsən nə ilə sizin çata bilmədiyiniz bir dərəcəyə çatdı?" Dedi ki:
“Əgər istərsən onlardan birini və ya ikisini sənə bildirim.” Dedim ki:
“İkisini də mənə bildir.” Dedi ki:
“İnsanlara bir şeyi əmr etdiyi zaman ona ən çox özü əməl edərdi, bir şeyi qadağan etdiyi zaman isə onu ən çox özü tərk edərdi.” Dedim ki:
“Bəs digəri nədir?” Dedi ki:
“Ondan başqa gizli halı aşkar halına daha çox bənzəyən birisini heç vaxt görmədim.”

* Rəvayət edilir ki, daha öncə Həsəni görməyən bir adam Bəsrəyə daxil olur və Şâbi[21]dən onu soruşur. O, isə deyir:

“Allah səni xeyrlə mükafatlandırsın! Məscidə gir! Əgər daha öncə bənzərini görmədiyin bir kimsəni görsən, bax Həsən odur.”

* Yenə deyilir ki, bir gün bir bədəvi Bəsrəyə gəlir və insanlardan soruşur: “Bu şəhərin ağası kimdir?” Dedilər ki, Həsən ibnu Əbi əl-Həsən. Soruşdu ki: “Nə ilə onun ağası olub?” Dedilər ki, o, insanların əllərində olan dünyalıqlara möhtac olmadı, onlar isə onun yanında olan dinə möhtac oldular. Bədəvi dedi: “Afərin! Əsl ağa bu cür olur.”

* İbnu Şəvzəb Matardan bu cür dediyini rəvayət etdi:

“Bir gün Həsəni ziyarət etmək üçün evinə daxil olduq. Evdə heç bir

---

[21] O, Âmir İbnu Şarahil əbu Âmr əş-Şâbidir. Əmin, güvənilən və fəqih bir alim idi. Hicrətin 100-cü ilindən sonra 80 yaşında vəfat etmişdir.

şey yox idi; nə döşək, nə xalça, nə yastıq, nə də ki həsir[22] vardı. Yalnız üzərində uzandığı bir yataq var idi.”

* Yenə deyilir ki, iki rahib onun yanından keçərkən, biri yoldaşına dedi: “Gəl, görünüşü Məsihin görüşünə bənzəyən bu adama yaxınlaşaq, necə birisi olduğuna baxaq.” Həsənin yanına yaxınlaşanda onun bu cür dediyini eşitdilər:

“Nəcə də qəribə bir qövmdür! Azuqə hazırlamaq ilə əmr olundular, yola çıxmağa çağırıldılar, Rəblərinə qovuşmağı gözlədikləri bir halda əvvəlləri axırları üçün həbs edildi. Bundan sonra isə onlar hələ də sərxoşluq içərsində çaşqın halda gəzirlər.”

Sonra Həsən saqqalı islanıncaya qədər ağladı. Həmin iki rahib isə dedi: “Bu adamdan eşitdiyimiz bizə bəs edər.” Sonra onun yanından ayrıldılar.

* Bəsrə əhlindən “Sizin ən aliminiz, Allahdan ən çox qorxanınız, ən zahid olanınız və ən gözəl olanınız kimdir?” deyə soruşulduqda öncə Həsənin adı ilə başlayar, daha sonra başqasını deyərdilər. Bəsrə haqqında danışdıqları zaman deyərdilər:

“Onun yaşlısı Həsəndir, gənci isə Bəkr ibni Abdullah əl-Muzəni[23]dir.”

* Məscidul Haram əhlindən bir adam demişdir: “İçərisində Həsən ibni Həsən əl-Bəsridən danışan adam olmayan heç bir camaat ilə

---

[22] Həsir: rütubətin və nəmliyin qarşısının alınması üçün qamışdan, küləşdən və bəzi ağacların liflərindən hazırlanan yer döşəməsidir.

[23] O, Bəkr ibni Abdullah ibni Amr əbu Abdullah əl-Muzəni əl-Bəsridir. Örnək alınan alimlərdən və xətiblərdən biri idi. Adı Həsən əl-Bəsri və Muhamməd ibni Sirin ilə birlikdə çəkilir. Hicrətin 108-ci ilndə vəfat etdiyi deyilir.

oturmaq istəməzdim, Allah ona rəhmət eləsin!”

* Davud ət-Taiyə Həsənin (rahiməhullah) ölüm xəbəri verildi və o dedi:

“Allah onu bağışlasın! Vallahi, o, qədrini yalnız itirdikdən sonra bildiyimiz sağlamlıq kimi idi.”

Hubeyb ibni Əvs bunu eşitdi və dedi:

“Baş vermiş hadisələr səni dərdə, müsibətə düçar edibsə,
(Bil ki,) həqiqətən də onun məhz sənə faydası toxunmuşdur.”

***Həsən az gülər və çox ağlayardı.***

* Abdulvahid ibni Zeyd onun haqqında bu cür demişdir: “Əgər Həsəni görsəydin, uzun müddət göz yaşlarını axıtdığına və içini çəkərək çoxlu ağlamağına görə deyərdin ki, sanki bütün məxluqatın hüznü onun üzərinə çöküb.”

* Bir dəfə ondan soruşdular: “Həsəni bizim üçün vəsf et.” Dedi ki:

“Allah Əba Səîdə[24] rəhmət etsin! Vallahi, gəldiyi zaman sanki yaxın əqrabasının dəfnindən qayıdırmış kimi gələrdi, getdiyi zaman isə elə bil başının üstündə atəş varmış kimi gedərdi. Oturduğu zaman sanki boynu vurulmaq üçün gətirilmiş bir əsir idi. Sabahladığı zaman sanki axirətdən gəlmişdi və axşamladığı zaman sanki əldən düşümüş bir xəstə idi.”

* Rəvayət edilir ki, bir gün Həsən məsciddə ikən dərindən nəfəs aldı və elə bir şiddətlə ağladı ki, hətta dizləri titrədi və qəlbi çırpındı. Sonra isə dedi:

---

[24] Əbu Səîd Həsən əl-Bəsrinin künyəsidir.

“Əgər qəlblər diri və təmiz olsaydı qiyamətə kimi gecədən sabaha qədər ağlayardı. Ey Allahın qulları! İnsanların, məhrəmləri açığa çıxdığı və gözlərin ağladığı həmin gündən başqa haqqında daha çox eşitmədiyi gün hansıdır ?!”

* Yunus ibni Abdullah dedi: “Həsənin qəhqəhə ilə güldüyünü heç vaxt görmədim.”

* Deyilir ki, Muhəmməd ibni Vasî Sabit ibni Muhhəmməd əl-Bunəni ilə oturdu və onu məclisində gülən, zarafat edən gördü. Dedi ki:

“Allah səni əfv etsin! Sən öz məclisində deyib-gülürsən?! Biz Həsən ilə oturduq, sanki axirətdən gəlmişdi, bizə onun şiddətlərindən danışırdı.” Sabit dedi:

“Allah Həsənə rəhmət etsin! Haqq əhlindən və ciddi birisi idi. Onunla bizim bənzərliyimiz haradadı?! Bizimlə Həsənin misalı bizdən öncəkinin dediyi kimidir:

Körpə dəvə iplə başqasına bağlanmazsa, azı dişləri çıxmış güclü dəvələrin hücumundan salamat qala bilməz.”[25]

* Deyilənə görə, bir gün Həsən insanlardan uzaqlaşdı. Onun yanına bir adam gəldi və dedi: “Ey Əba Saîd! Allah sənə xeyir bəxş etsin ! Sənin yalnızlıqdan həlak olacağından qorxduq!” O isə dedi: "Ey qardaşım oğlu! Allah subhanəhu təala ilə birlikdə olub qorxan kimsə

---

[25] Yəni demək istəyir ki, zəif olan kimsə hər nəqədər güclü olanın əməllərini etməyə çalışsa da onun kimi güclü olmaqdan acizdir. Buna iki yaşını tamamlayıb üçüncü ilinə keçmiş dəvəni misal gətirir. Həmin körpə dəvə çox zəifdir, özündən çox güclü olan, səkkizinci ilini tamamlamış və azı dişləri çıxmış güclü dəvələrin hücumlarından özünü müdafiə edə bilməz. Onun həmin dəvələrin hücumundan qorunması üçün başqa güclü dəvəyə, yəni anasına iplə bağlanmasına ehtiyacı var.

axmaqdan başqası deyil.”

* Həsənin xidmətçisi Humeyd dedi: “Bir gün Şâbi mənə dedi: 'Həsən tənha olduğunda mənə bildir, onunla təkbaşına görüşmək istəyirəm.' Bunu Həsənə xəbər verdim və mənə dedi: 'Ona bildir ki, nə vaxt istəsə buyursun gəlsin.'

Bir gün Həsən tənha idi. Bunu Şâbiyə bildirdim, o, da dərhal gəldi və Həsənin evinə getdik. Onu qibləyə yönələrək bu cür dediyini gördük:

'Ey Adəm oğlu! Yox idin, var oldun. İstədin, istədiyin sənə verildi, səndən istədilər, sən isə xəsislik etdin. Yazıq olsun sənə! Vallahi necə də pis iş gördün!'

Ona salam verdik və bir saat ayaqda durduq, o, bizə tərəf baxmadı, heç bizim varlığımzı belə hiss etmədi. Şâbi dedi ki:

'Vallahi, Adam bizim yerimizdən başqa bir yerdədir.' Onunla birlikdə oturmadan yanından ayrıldıq.”

* Bir gün ondan soruşuldu:

“Ey Əbu Saîd! Necə sabahladın?” Dedi ki:

“Vallahi! Gəmisi dənizin dərinliklərində parçalanan kimsədən daha böyük müsibətə sahibəm.” Soruşuldu ki:

“Bu nəyə görədir?” Dedi ki:

“Çünki mən günahlarımın olmasından əminəm, itaətlərimin və əməllərimin qəbulundan isə qorxu içərisindəyəm. Bilmirəm ki, onlar məndən qəbul edilib, yoxsa üzümə çırpılacaq?” Soruşuldu ki:

“Bunu sənmi deyirsən, ey Əba Səîd?!”

“Nəyə görə deməyim ki? Kim bilir, bəlkə də Allah subhanəhu təala sevincli hallarımın birində mənə baxar və ona görə mənə qəzəblənər. Sonra da tövbə qapısını üzərimə bağlayar və məğfirət ilə mənim arama girərək bütün işlədiyim əməlləri heç işlənməmiş kimi sayar. Məni bunların olmayacağından əmin edən şey nədir axı?!”

* Malik ibni Dinar demişdir: “Həsəni (Allah ona rəhmət etsin) öldükdən sonra yuxumda sevincli halda, bəmbəyaz, göz yaşlarının axdığı yerləri parıldayan vəziyyətdə gördüm. Dedim ki:

'Sən ölmədinmi?' Dedi ki:

'Bəli' Dedim ki:

'Ölümdən sonra necə oldu bu hala gəldin? And olsun ki, sən dünyada çox kədərli idin.' Dedi ki:

'Vallahi, o kədər bizim üçün salehlərin mənzilinə yolu göstərən bayrağı qaldırdı, biz də onun savabı ilə müttəqilərin yurduna yerləşdik. Allaha and olsun ki, bu Allahın bizə olan lütfündən başqa bir şey deyildir.' Dedim ki:

'Ey Əba Səid! Bəs bizə nə etməyi buyurursan?' Dedi ki:

'Axı nə ola bilər ki? Dünyada ən çox kədərli olan insanlar axirətdə ən çox sevinənlərdir.' “

* Həsən demişdir: “Ey Adəm övladı! Əgər Quranı oxuyub, sonra isə ona iman etsən, mütləq dünyadakı hüznün uzanar, dünyadakı qorxun şiddətlənər və dünyadakı ağlamağın çoxalar.”

***Cəhənnəm əzabından çox qorxardı:***

* Bir nəfər onun yanına girdi və o ağlayırdı. Soruşdu ki: “Allah sənə xeyir bəxş etsin! Səni ağladan şey nədir?” Dedi ki: “Vallahi, sahibimin  məni cəhənnəmə daxil etməsindən və mənə əhəmiyyət verməməsindən qorxuram.”

* Yusuf ibni Ubeyddən soruşuldu: “Həsənin etdiyi əməlləri edən bir adam tanıyırsanmı?" Dedi ki: "Allah Həsənə rəhmət etsin! Vallahi, mən heç onun danışdığı kimi danışan birisini tanımıram, onun etdiyi

əməli edəni necə tanıyım?! Yanında cəhənnəm atəşindən danışıldığı zaman sanki o, yalnız cəhənnəm üçün yaradıldığını düşünərdi. Sanki cəhhənəm ilə cənnət onun gözləri önündə idi, qorxu və ümid içərisindən başqa bir halda heç vaxt görülmədi. Biri digərini üstələməzdi, ikisi arasındakı bir hal içərisində olardı."[26]

* Bir nəfər ondan Tammə[27] (qiyamət günü) haqqında soruşdu. Dedi ki:

"O elə bir saatdır ki, həmin günü insanlar cəhənnəm əzabına götürüləcəklər, ora necə də pis dönüş yeridir. Cəhənnəm atəşindən və atəşə aparan əməllərdən Allaha sığınırıq."

* Bir gün onun məclisində cəhənnəm atəşindən danışıldı. Dedi ki:

"Peyğəmbər sallallahu aleyhi və səlləmdən bu cür dediyi rəvayət edilir:

---

[26] Bu, əhli sünnənin ibadətlərdə izlədiyi orta yoldur: qorxu və ümid içərisində Allaha ibadət etmək. Onlar bu ikisini quşun iki qanadına bənzətmişlər. Belə ki, quş iki qanadından biri olmazsa uça bilməz, onun havada sabit qalmasına səbəb olan iki qanadıdır. Müsəlmanın da Allaha ibadətlərində sabit qalması qorxu və ümid qanadlarının birlikdə olması ilə mümkündür. Onlardan birini itirərsə və ya azaldıb-çoxaldarsa orta yoldan ayrılar. Necə ki, bidət firqələrindən olan Xəvariclər və Mötəzilələr qorxu tərəfini çoxaltdılar, ümid tərəfini isə azaltdılar. Bununla da günah işləyən qulların cəhənnəmlik oladuğuna və bağışlanmayacaqlarına inanaraq Allahın bağışlayan və mərhəmət edən olduğunu unutdular. Digər bidət firqəsi Murcиələr ilə Cəhmiyyələr isə əksinə ümid tərəfini artırdılar, qorxu tərəfini isə azaltdılar. Bununla da bir insanın müsəlman olduqdan sonra İslamdan çıxaracaq şirk və küfr əməlləri, sözləri işləsə belə Allahın onları bağışlayacağını ümid edərək Allahın şiddətli əzab verən olduğunu unutdular. Əhli Sünnə isə bu ikisi arasında orta yol tutaraq böyük günah işləyənlərin əbədiyyən cəhənnəm atəşində yanmayacaqlarını, hətta Allahın şirk və İslamdan çıxaran günahlardan başqa bütün günahları qullarından dilədiyi kimsələrə bağışlayacağına inanır. Necə ki, bu barədə Allah azzə və cəllə buyurmuşdur: ***«Şübhəsiz ki, Allah Özünə şərik qoşulmasını əsla bağışlamaz, bundan başqa (günahları) isə dilədiyi kimsəyə bağışlayar.»*** **(Nisa, 48)**

[27] Naziat surəsində keçən tammətul kubra – böyük fəlakət, yəni qiyamət günü mənasına gələn sözdən götürülüb.

**“Bir nəfər illərlə atəşdə qaldıqdan sonra (bir gün) oradan çıxacaq.”[28]**

Sonra Həsən dedi: “Kaş ki, həmin adam mən olaydım.”

* Bu cür deyərdi: “Yer üzü öz genişliyinə baxmayaraq özünə dar gələn insandan başqası cəhənnəm atəşini gerçəkdən doğrulamış olmaz. Xeyr, vallahi cəhənnəm atəşini öz ətində və qanında hiss etməyən onu gerçəkdən doğrulamamışdır.”

***Çoxlu dua edər və bağışlanma diləyərdi:***

* Həsən bir yerə səfər etmək istəyəndə bu cür deyərdi:

“Ey Özünə bir şey əmanət buraxılanda onu qoruyan və (əmanəti) yerinə yetirən (Allahım)! Ailəm və övladımdan məndən uzaqda olanı və mənimlə birlikdə olanı, əlimin sahib olduğu hər şeyi sənə əmanət edirəm. Ey əmanətləri zay etməyən (Allahım)! Onları qoru!”

* Kədərləndiyində və başına bir müsibət gəldiyində bu cür deyərdi:

“Ey İbrahimin əlini oğlu İsmaili kəsməkdən əngəlləyən Allahım! Onlar ki, öz duyğularını bir-birinə açdılar və oğlu dedi: 'Mərhəmət et, atacan!' İbrahim isə dedi: 'Ey oğlum! Rəbbimizin əmrinə səbr et.'

Çöllük bir ərazidə və quyunun dərinliklərində olan Yusuf üçün karvanı göndərən, köləlikdən sonra onu hökmdar edən Allahım! Ey üç qat qaranlıqlar içərisində Zünnun[29]un fısıltısını eşidən! Ey Yaquba

---

[28] Hədisin əsli “Səhihu-Buxari, Riqaq: (11/416)”-da keçir**: "Cəhənnəmin alovu toxunduqdan sonra bir qrup insan oradan çıxacaq və cənnətə girəcək. Cənnət əhli onları cəhənnəmiyyun (cəhənnəmdən gələnlər) adlandıracaqlar."**

[29] Zünnun Yunus peyğəmbərin (aleyhissəlam) ləqəbidir, mənası balıq sahibi deməkdir. Ərəbcədə nun (نون) kəliməsi böyük balıq deməkdir. Rəvayətə görə Yunus peyğəmbər Mosul şəhərinin yaxınlığında yerləşən Ninova

əhalisini Allahı birləməyə dəvət etməsi üçün göndərilmişdir. Lakin uzun illər içərisində iki nəfərdən başqa heç kim ona iman etməmişdi. Allaha iman etməyəcəkləri təqdirdə başlarına əzab gələcəyini onlara bildirdi. Onlar isə: 'bir nəfərin üzündən başımıza əzab gəlib hər kəsi məhv edəcəksə buyursun gəlsin'- deyərək istehza etdilər. Yunus (aleyhissəlam) da onların hərəkətlərinə üzülərək aralarından ayrıldı. Allah Yunus peyğəmbərə vəhy edərək onlardan ayrılmaqda tələsdiyini bildirdi. Geri dönüb qırx gün daha onları Allaha dəvət etməsini əmr etdi. Həmin müddət bitincəyə kimi iman etməzlərsə başlarına əzab göndərəcəyini vəd etdi. Yunus peyğəmbər də ona vəhy edilən kimi insanları tövhidə dəvət etdi. Lakin onlar yenə iman etmədilər. Son üç gün qalmış Yunus peyğəmbər qövmünün inadkarlığına səbr etməyib onlara əzab gələcəyini bildirərək onları tərk etdi. Göy üzünün qaralmağa başladığını görüncə insanlar əzabın yaxınlaşdığını anladılar və bundan qorxub, dərhal tövbə edərək iman etdilər. Allah da onların tövbəsini qəbul etdi və onlara əzab vermədi. Qövmünə əzabın gəlmədiyini öyrənən Yunus peyğəmbər onların yanında yalançı vəziyyətinə düşdüyünü fikirləşərək qəzəbli halda həmin bölgəndən ayrılır və içərisində insanlar olan bir gəmiyə minir. Gəmi yola çıxdıqdan sonra dənizin ortasında hərəkətsiz halda qalır və onun batmaq təhlükəsi yaranır. Gəmidəki insanlar aralarında bir günahkar kimsənin olması səbəbi ilə bunun baş verdiyini düşündülər. Aralarında püşk ataraq kimin adı çıxarsa onu dənizə atmaq üzərində anlaşdılar. Bu vaxt Yunusun (aleyhisəlam) adı çıxır və onu dənizə atırlar. Bütün bunların öz xətası səbəbi ilə başına gəldiyini anlayan Yunus peyğəmbər öz nəfsini qınayır. O bu halda ikən böyük bir balıq onu udur. Balığın qarnında çox üzgün bir halda Rəbbinə dua edir: “Səndən başqa heç bir ilah yoxdur, Səni tənzih edirəm. Həqiqətən də mən zalimlərdən olmuşam.” Allah azzə və cəllə onun duasını qəbul edir və balığın qarnından qurtarır. Həmin qissəni Allah azzə və cəllə Qurani Kərimdə bu şəkildə xəbər vermişdir:

***«Zün-Nunu da (xatırla!) O vaxt qəzəbli halda (qövmündən ayrılıb) getmişdi və onu sıxıntıya salmayacağımızı zənn etmişdi. Sonra isə qaranlıqlar içərisində səslənərək demişdir: "Səndən başqa heç bir ilah yoxdur, Səni tənzih edirəm. Həqiqətən də mən zalimlərdən olmuşam." Biz də onun duasını qəbul etdik və onu qəmdən qurtardıq. Biz iman edənləri bu cür xilas edirik.»*** **(Ənbiya, 87-88)**

***«Həqiqətən də, Yunus elçilərdəndir. O vaxt o, dolu bir gəmiyə tərəf qaçmışdı. (Gəmidəkilərlə) birlikdə püşk atmışdı və uduzanlardan olmuşdu. O, özünü qınayarkən balıq onu udmuşdu. Əgər o, Allaha tərif deyənlərdən olmasaydı, dirildiləcəkləri günə qədər balığın qarnında qalardı. O, xəstə olduğu bir halda onu boş bir yerə atdıq. Başının üstündə (kölgəlik salan) balqabaq tağı bitirdik. Onu (sayları) yüz min və ya daha artıq olan bir qövmə elçi göndərdik. Onlar da iman etdilər, Biz də müəyyən vaxta kimi onları (nemətlərdən) faydalandırdıq.»*** **(Saffat, 139-148)**

***«Sən Rəbbinin hökmünə səbr et və balıq sahibi (Yunus peyğəmbər) kimi olma. O vaxt o, qəm-kədər içində (Rəbbinə) dua etmişdi. Əgər Rəbbindən***

görmə qabiliyətini geri qaytaran və onun hüznünü sevincə çevirən! Ey Davudun göz yaşlarına mərhəmət edən, Eyyubun sıxıntılarını aradan qaldıran! Ey çarəsiz halda olan kimsə dua etdiyində duasını qəbul edən, Ondan yardım istəyən və yardımını umanlara yardım edən! Ey Özündən başqa ibadəti haqq edən heç bir rəbbin olmadığı, qəlblərdəki sirləri bilən və bəlaları dəf edən Allahım! Səndən, seçilmiş peyğəmbərin və razı qalınmış qulun Muhəmmədə, Onun ailəsinə və əshabına salat etməyini istəyirəm. Səndən məni üzüntüyə salan şeydən qorumağını və dərddən qurtarmağını istəyirəm.

Ey istənilənlərin ən xeyirlisi, ümid edilənlərin ən fəzilətlisi, rəhm dilənilənlərin ən rəhmlisi! Mənim üçün xeyirli nədirsə onu et! Ey mərhəmət edənlərin ən mərhəmətlisi!

Allah mənə yetər və O nə gözəl vəkildir."

* Xəstələndiyi zaman bu cür deyərdi:

"Allahım! Məni, xəsətələndiyində peşman olan, sağaldığında fitnəyə düşən və yoxsullaşanda üzülən kimsələrdən etmə. Allahım! Məni Səninlə kifayətlənənin kifayəti ilə kifayətləndir, Səndən sağlıq istəyənin sağlığı ilə məni sağalt. Allahım! Məni Öz məhəbbətinə və rizana müvəffəq et! Ey mərhəmət istəyənlərə mərhəmət edən, dua edənlərin duasını qəbul edən!"

* Deyilənə görə xəvariclərdən bir nəfər Həsənin məclisinə gələrdi və oradakılara əziyyət edərdi. Həsənə deyildi ki: "Onu əmirə şikayət etməyəkmi?"

O isə dedi: "Ona qarşı əmirin Rəbbinin bizə yetərli olacağını umuram."

Bir gün adam gəldiyi zaman Həsən onu gördü və qibləyə tərəf

---

***bir nemət ona yetişməsəydi, o, qınanılmış bir halda boş yerə atılacaqdı. Ancaq Rəbbi onu seçdi və onu salehlərdən etdi.»*** **(Qələm, 48-50)**

yönələrək dedi:

“Allahım, ona qarşı məni istədiyin kimi qoru.” Sonra adam miniyinin üzərindən yerə düşdü və ölmüş vəziyyətdə ailəsinin yanına aparıldı. Bu Həsənə bildirildiyində o, dedi: “Onunla kifayətlənəni qoruyana və dua edənin duasını qəbul edən Allaha həmd olsun! Vay o kəsin halına ki, Rəbbinə qarşı aldanmışdır!”

* Məclisi bitirərkən bu cür deyərdi: “Allahım, məni ötüb-keçənlərdən saleh kimsələrin (zümrəsinə) qat, geriyə qalanların isə salehlərindən et. Məni nəfsimin şərrindən və şər sahibi olan hər şeyin şərindən qoru.”

## İkinci fəsil: Elm və alimlərin fəziləti haqqında dediyi sözlər

* Bu cür deyərdi: “Elm olmasaydı insanlar heyvanlar kimi olardılar.”[30]

* Həmçinin demişdir: "Əgər övliyalar olmasaydı, yer batıb yox olardı. Salehlər olmasaydı, ümmət həlak olardı. Alimlər olmasaydı, insanlar heyvanlar kimi olardılar. (Adil) sultanlar olmasaydı, insanlar bir-birilərini yeyərdilər. Axmaqlar olmasaydı, dünya xarab olardı. Külək olmasaydı, göy ilə yerin arasında olanlar pis qoxardı.”

* Bu cür deyərdi: “Kim Allah üçün elm tələb edərsə, çox keçmədən bu onun xuşusunda[31], zühdündə və təvazusunda görünər.”

* Bu cür deyərdi: “Allah azzə və cəllə qula öyrəndiyi elmə görə bir dəyər qoymamışdır, yalnız müəllimin aldığı dəyər müstəsnadır. Kim elmi Allahın haqqı üçün və Allah qatındakıları istəyərəkdən öyrənərsə, mütləq qazanar. Kim də elmi Allahdan başqası üçün öyrənərsə, (əməli) kəsilər və o, Allahu təalaya çatmaz.”

* Onun hüzurunda səhabələrdən (Allah onlardan razı olsun) danışıldı və o dedi:

“Allah ruhlarını mübarək etsin! Onlar şahid oldular, biz isə yox idik, onlar bildilər, biz isə cahil idik. Buna görə də onların üzərində icma

---

[30] Yəni insanlar heyvanlardan elmə görə fərqlənirlər. Yoxsa yeyib-içmək, şəhvətlərini və digər ehtiyaclarını təmin etmək heyvanlarda da olan xüsusiyyətlərdir.

[31] Xuşu Allahdan qorxaraq, qəlbin Allaha yönəlməsi və itaətidir.

etdiklərinə tabe olduq və ixtilaf etdiklərində durduq.[32]”

* Bir nəfər Həsəndən bir şey barəsində soruşdu, o da cavab verdi. Həmin adam ona dedi:

“Fəqihlərdən kiminsə bunu dediyini eşitmədik!” O isə bu cür dedi: “Sən heç fəqih görmüsənmi?! Fəqih, yalnız dünyada zahid olan, axirəti istəyən, ibadətlərə davam edən, aldatmayan və çəkişməyən, Allahın hikmətini yayan kimsədir. Əgər ondan qəbul etsələr Allaha həmd edər, əgər rədd etsələr yenə Allaha həmd edər.”

* Bir gün bir adam ona dedi: “Ey Əba Saîd! Mənə bir hədis rəvayət etmişdin, onu unutdum." Həsən isə bu cür dedi: "Əgər unutqanlıq olmasaydı, fəqihlər çoxalardı.”

* Bu cür deyərdi: “Elm ən xeyirli mirasdır, ədəb ən gözəl dostdur, təqva ən yaxşı azuqədir, ibadət ən qazanclı sərmayədir, ağıl ən yaxşı rəhbərdir, gözəl əxlaq ən xeyirli yoldaşdır, yumuşaqlıq ən yaxşı yardımçıdır, qənaət ən üstün zənginlikdir, barışdırmaq ən xeyrli yardım etməkdir və ölümü xatırlatmaq nəsihətlərin ən gözəlidir.”

* Bu cür deyərdi: “Alimlərin elmini və hikmət sahiblərinin hikmətini özündə toplayan, lakin haqq olan yolda səfehlərin izi ilə gedən kimsələrdən olma.”

* Bu cür deyədi: “Rəsulullah (sallallahu aleyhi və səlləm)-in bu cür dediyi rəvayət edilmişdir:

---

[32] Yəni onlar peyğəmbərimizi gördülər və Quranın üzərinə nazil olduğu hadisələrə şahid oldular. Buna görə də onlar Allahın Kitabını və Rəsulunun Sünnəsini, əhkamları və halal-haramı hər kəsdən daha yaxşı bilirdilər. Biz bunlara şahid olmadığımıza, məsələləri onlar kimi bilmədiyimizə və anlamadığımıza görə onların yoluna tabe olmağımız qaçınılmazdır.

**'Elm iki qismdir: qəlbdə olan elm, bu faydalı olan elmdir və dildə olan elm, bu isə Allahın Adəm övladı üzərindəki hüccətidir.' ”[33]**

* Bu cür deyərdi: “Fəhm, elmin qabıdır. Elm əməlin dəlilidir. Əməl isə xeyrin öndəridir. Nəfsani istəklər günahların miniyi, mal inkarçıların xəstəliyi, dünya isə axirətin bazarıdır. Allahın nemətləri ilə günahlar işləyənin vay halına!”

* Bu cür deyərdi: “Alimlərin cahillər barəsindəki misalı, həkimlərin xəstələr barəsindəki misalı kimidir.”

* Deyildi ki, bir gün təkkəbbürlü bir adam onu bu cür çağırdı:
“Ey Əbu Səîd!” O isə dedi:
“Dinar və dirhəmlərlə məşğul olmağın və onları toplamağın səni 'Ey Əba Saîd!'[34] deməyinə mane oldu.” Sonra isə dedi: “Allah sizə rəhm etsin! Dininiz üçün elmi, bədəninizi üçün tibbi, dilin düzgünlüyü üçün nəhvi[35] öyrənin!”

---

[33] Darimi, (1/102); Ibni Abdilbər- "Camiu bəyanil ilmi va fadlihi", (1/190)

[34] Ərəbcədə (يا أبا سعيد) və dilimizə 'Ey Əba Saîd' kimi tərcümə olunan ifadə xitab (nida) ədatı və xitab olunan şəxsdən (munədə) ibarət söz birləşməsidir. Burada xitab ədatı dilimizə 'ey' kimi tərcümə olunan (يا)-dir, xitab olunan şəxs isə izafə tərkibli (təyini söz birləşməsi) olan və dilimizə 'Əbu Səid- yəni Səîdin atası' kimi tərcümə olunan (أبو سعيد)-dir. Ərəb dilinin qaydalarına əsasən izafə tərkibli söz birləşməsinə xitab edərkən (munədə) onun başında gələn xitab (nida) ədatı son hərəkəsinə təsir edərək onu mənsub (yəni təsirlik halında) edər. Bu zaman munədənin son hərəkəsi dəyişir. Buradakı munadə (yəni أبو سعيد - Əbu Səîd) xitab halında başına gələn nida ədatının (yəni يا - ey) səbəbi ilə mənsub olaraq (يا أبا سعيد) – 'Ey Əba Saîd' kimi ifadə olunur.
Həsəni əl-Bəsriyə səslənən həmin adam dünya işləri ilə, xüsusəndə mal-dövlət toplamaqla çox məşğul olduğuna görə ərəb dilində sözləri necə ifadə edildiyindən cahil qalmışdır. Həsəni əl-Bəsri də buna görə onu qınadı.

[35] Nəhv, ərəb dili qrammatikası elmlərindən biridir. Nəhv elmi (yəni sintaksis) tərkib halındakı ərəbcə kəlimələrinin irab (hallanan) və ya bina (hallanmayan) yönündən son hallarınını bildirən qaydalar elmidir. Yəni

* Bu cür deyərdi: “Əgər həlim birisi deyilsənsə, elə isə özünü həlim göstərməyə çalış. Əgər alim deyilsənsə, elə isə (elm) öyrən. Adam özünü nə qədər az da olsa bir qövmə bənzədərsə, mütləq onlardan biri olar.”

---

nəhv elmi ərəbcə kəlimələrinin son hərəkələrinin dəyişməsi ilə bağlı əhkamları öyrədən qaydalar elmidir.

## Üçüncü fəsil: Gözəl əxlaqi dəyərlər və bəzi ədəblər haqqında dediyi sözlər:

***Gözəl əxlaq haqqında:***

* Bir nəfər ondan gözəl əxlaqın nə olduğunu soruşdu, o da dedi:

"Cömərdlik, əfv etmək və səbrli olmaqdır."

* Ondan soruşuldu: Ən üstün əxlaq hansıdır? Dedi ki: "Cömərdlik və doğru sözlülük."

* Sonra yenə Həsən bu cür dedi: "Sələfi saleh sizə ədəbi və gözəl əxlaqları öyrətmişdir. Elə isə onları öyrənin ki, Allah da sizə rəhm etsin!"

* Bu cür deyərdi: "Əgər Allah azzə və cəllə diləsəydi sizi içinizdə heç bir fəqirin olmadığı zənginlərdən edərdi. Əgər diləsəydi sizi içinizdə heç bir zənginin olmadığı fəqirlərdən edərdi. Lakin Allah hansı şəkildə əməl edəcəyinizə baxmaq üçün sizi bir-birinizlə imtahan etdi. Sonra qullarına gözəl əxlaqları göstərdi və dedi:

***«Hətta özləri ehtiyac içində olsalar belə, onları özlərindən üstün tuturlar. Nəfsinin tamahından qorunan kimsələr nicat tapanlardır.»*** **(Həşr surəsi,9)**"

* Bu cür deyərdi: Ömər ibnul Xattab (Allah ondan razı olsun) deyərdi:

"Bir-birinizlə qarışın və bir-birinizdən ayrılın."

Sonra Həsən deyərdi: "Gözəl əxlaqi işlərdə insanlarla qarışın, çirkin

işlərdə isə onlardan ayrılın.”

* Ondan soruşuldu ki, mürüvvət nədir? Dedi ki: “(Başqalarının əllərindəkinə) göz dikməməyindir, yoxsa ki, həqir olarsan və (insanlardan əllərindəkini) istəməməyindir, yoxsa ki, (onların yanında) dəyərin düşər.”

* Bu cür deyərdi: “Gözəl əxlaqi dəyərlər ilə insanlara yoldaş ol. Çünki onların arasında qalacağın zaman həqiqətən çox azdır.”

* Bir gün bir adam ona dedi: “Ey Əba Saîd! Hansı libas sənə daha sevimlidir?”
O isə dedi: “Ən qalını, ən sərti və insanların yanında ən dəyərsiz olanı.”
Adam belə dedi: “Məgər bu cür rəvayət olunmayıbmı:

'Şübhəsiz ki, Allah gözəldir, gözəl olanı sevər.'[36]?!”

O isə dedi: “Qardaşım! (Bu hədis barəsində) doğru görüşdə deyilsən. Əgər Allah qatında gözəllik libas olsaydı, o zaman günahkarlar Onun yanında ən şərəfli insanlar olarlardı. Gözəllik yalnız saleh əməllər işləməklə, günahlardan çəkinməklə, gözəl və üstün əxlaqi dəyərlər ilə Allaha yaxınlaşmaqdır. Səhih hədisdə Allah Rəsulundan (sallallahu aleyhi və səlləm) bu şəkildə rəvayət edilmişdir:

**'Mən gözəl əxlaqi dəyərləri tamamlamaq üçün göndərildim'** [37]”

* Bu cür deyərdi: “Ləyaqətli kimsənin izzəti onun ədəbidir, təqvası isə şərəfidir.”

---

[36] “Səhihu-Muslim, İman: (1/91)”

[37] İmam Malik bu hədisi “Muvatta, Gözəl əxlaqlar babı: (8)”-da **“Gözəl əxlaqı tamamlamaq üçün göndərildim.”** şəklində rəvayət etmişdir.

***Çox yeməmək haqqında:***

* Əbu Süleyman əd-Dəraniyə Həsənin bu cür dediyi söyləndi:

“Kim qəlbinin qorxmasını və göz yaşlarının çox olmasını istəyirsə, qarnının yarısını doldursun.”

Əbu Süleyman dedi: “Allah Əba Səîdə rəhmət eləsin! Vallahi, o elə bir insanlardan idi ki, onlar öz nəfslərini düzəldər və hesab günündən öncə onu hesaba çəkərdilər. Mən onun qazananlardan olacağını umuram, Allah ona rəhmət etsin!”

* Bir gün ondan soruşuldu:

“Ey Əba Səîd! Qəlbə hüznü salan şey nədir?” Dedi ki:
“Aclıq.” Deyildi ki:
“Bəs onu çıxaran şey nədir?” Dedi ki:
"Toxluq.”

* Yenə bu cür deyərdi: “Çox yeməkdən və çox yatmaqdan Allaha tövbə edin!”

* Malik ibnu Dinar[38] demişir: “Bir gün Həsənin yanına girdim və o yemək yeyirdi. Dedi ki:

‘Ey qardaşımın oğlu ye!’ Dedim ki:
‘Yemişəm.’ Dedi ki:
‘Əgər yesən, mənə kömək etmiş olarsan!’ Dedim ki:
‘Vallahi artıq doymuşam.’ Həsən dedi:
‘Subhanəllah! Mömin kimsənin doyuncaya kimi yeyəcəyini, sonrada qardaşına yardım etməyə qadir olmayacağını zənn etməzdim.’

---

[38] O, Malik ibnu Dinar əl-Bəsridir. Tabiînlərdən olan zahid və güvənilən bir alim idi. Künyəsi Əbu Yahya idi. Taun xəstəliyinin yayılmasından qısa müddət öncə vəfat etmişdir. Taun xəstəliyi isə hicrətin 131-ci ilində yayılmışdır.

***Yeməyin xislətləri haqqında:***

* Bu cür deyərdi: “Yeməkdə on iki xislət var: dördü fərz, dördü sünnə, dördü isə ədəbdir.

Fərzlərə gəldikdə: (onlar) Allahın adını çəkmək, əslinin təmiz (yəni yeyilməsi xoş görülən şeylərdən) olması, mövcud olana riza göstərmək və nemətə şükr etməkdir.

Sünnələrə gəldikə isə: (onlar) sağ ayağın üzərində oturmaq, önündən yemək, yeməyi sağ əlin üç barmağı ilə qəbul etmək və barmaqları yalamaqdır.

Ədəblərə gəldikdə isə: (onlar) əlləri yeməkdən əvvəl və sonra yumaq, loxmanı kiçiltmək, onu yaxşı çeynəmək və gözləri yemək yeyənlərin üzlərinə baxmaqdan başqa istiqamətə çəkməkdir.”

***Səbr və səbr etməyin fəziləti haqqında:***

* Həsən bu cür deyərdi: “Səbr, cənnət xəzinələrindən bir xəzinədir. İnsan xeyrin hamısına yalnız bir saatlıq səbr ilə yetişə bilər.”

* Bu cür deyərdi: “Ey insanlar! Sizlər canlarınızın istədiyi şeyləri tərk etmədən sevdiklərinizə nail olmazsınız və xoşlamadığınız şeylərə səbr etmədən ümid etdiklərinizə çata bilməzsiniz.”

* Rəvayət edildi ki, Həsənin hüzurunda iki adam bir-birini söydü. Söyülən adam ayağa qalxdı və üzündən təri silərək (ayəni) oxudu:

***«Hər kim səbr edib bağışlasa, şübhəsiz ki, bu məqsədə uyğun işlərdəndir.»*** **(Şura, 43)**

Həsən isə dedi: “Afərin ona! Vallahi cahillərin (ayənin hökmünü) zay etdikləri bir halda, o isə onu dərk etdi.”

* Yenə demişdir: “Ey Adəm övladı! Ya səbr edəcəksən, ya da həlak

olacaqsan.”

* Bu cür deyərdi: “Səbr iki cürdür: müsibət anında edilən səbr və günahlara qarşı edilən səbr. Kim günahlara qarşı səbr etməyə qadir olsa, iki səbrin ən üstününə nail olar.”

* Bu cür deyərdi: “Tövratda bu cür yazılmışdır: zənginlik qənaətdə və insanlardan səlamətdə olmaqdır, sağlamlıq şəhvətləri rədd etməkdədir, qurtuluş (nəfsin) istəklərini tərk etməkdədir, uzun bir zamandan (yəni axirətdən) faydalanmaq qısa ömürdə səbr etməklədir.”

* Bu cür deyərdi: “Allah rəhm etsin o kimsəyə ki, baxar və düşünər, düşünər və ibrət alar, ibrət alar və anlayar, anlayar və səbr edər.
Bəzi insanlar anladılar, sonra isə səbr etmədilər və qəlblərindəki hüzün getdi. Onlar isə nəyi tələb etdiklərini dərk etmədilər və ayrıldıqları şeyə dönmədilər. Beləcə, dünyalarını və axirətlərini itirdilər, bu isə açıq-aşkar ziyandır.”

### *Çox gülməmək*

* Bu cür deyərdi: “Ey Adəm övladı! Gülməyi azalt! Çünki çox gülmək qəlbi öldürür, sevinci yox edir, müruvvəti düşürür və sahibini yüngül göstərir.”

* Rəvayət edilir ki, bir gün bir nəfər gülərək Həsənin yanından keçirdi. Həsən ona dedi:

“Ey qardaşımın oğlu! Sirat körpüsünü keçdinmi?" O isə dedi: "Xeyr.”
Həsən dedi: “Bəs cənnətəmi yoxsa cəhənnəməmi gedəcəyini bildinmi?” Adam dedi ki:
“Xeyr.” Həsən dedi:

“Allah səni əfv etsin! İş qorxulu olduğu halda bəs nə üçün gülürsən?”

Deyilənə görə həmin adam bundan sonra ölənə kimi bir daha gülən halda görülmədi.

* Bu cür deyərdi: “Mənə çatan xəbərə görə salehlərdən biri (son) məkanının iki yurddan hansının: cənnətmi yoxsa cəhənnəmmi olacağını bilənə kimi Allahın onu gülən halda görməməsi üzrə özü üçün qərar almışdı. Bununla o (Allah ona rəhmət etsin) var gücü ilə elə bir əzm etmişdir ki, Allah (azzə və cəllə) ilə qovuşana kimi heç gülən vəziyyətdə görülməmişdi.”

* Bu cür deyərdi: “Rəvayətə görə Allah subhanəhu təala İsaya (aleyhissəlam) bu cür vəhy etmişdir:
‘Ey İsa! Qafilləri gülən halda gördüyün zaman sən gözlərinə ağlamaq ilə sürmə çək.’ ”

***Əbəs işlərlə məşğul olmağı tərk edib, əməl etmək haqqnda:***

* Bir dəfə Həsən xırda daşlarla oyalanan yaşlı bir adamın bu cür dediyini gördü: “Allahım! Məni huri-aynla[39] evləndir!" O isə belə dedi: "Huri-ayn istəyir, ancaq dəlilərin oynadığı kimi oynayır!”

* Bu cür deyərdi: “Şübhəsiz ki, Allah subhanəhu təala sizin əməlləriniz üçün ölümdən başqa bir möhlət qoymamışdır, elə isə (ölüm gələnə kimi) əməl etməyə davam edin. Çünki Allah (cəllə sənauhu) buyurmuşdur:
***«Sənə yəqin (ölüm) gələnədək Rəbbinə ibadət et.»*** **(Hicr, 99)”**

---

[39] Huri-ayn iri gözlü cənnət qadını deməkdir. Allah subhanəhu təala Vaqiə surəsində buyurmuşdur:

***«(Onlar üçün cənnətdə) iri gözlü hurilər də vardır. Sanki (həmin hurilər) sədəf içərisində gizlənmiş incilərdir.»*** **(Vaqiə, 23)**

* Çox işsiz olan və dinində onu əlaqələndirən işlərdən heç biri ilə məşğul olmayan bir adam görəndə bu cür söyləyərdi:

“Bir azuqən olmadığı halda, azuqəsi olan insanlarla yoldaşlıq etməyin səni sevindirir?”

* Bu cür deyərdi: “Ey Adəm oğlu! Kişi sevdiyi ilə bərabərdir deməyin səni aldatmasın. Sən salehlərə yalnız onların əməllərini işləməklə qovuşa bilərsən. (Yoxsa) yəhudiər və nəsranilər də öz peyğəmbərlərini sevirlər, (lakin) vallahi onlarla birlikdə həşr olunmayacaqlar və onların zümrəsinə daxil olmayacaqlar. Şübhəsiz ki, onlar cəhənnəmin yanacağıdırlar və (mütləq) ora girəcəklər.”

* Bu cür deyərdi: “Ey insan! Sən sadəcə (sayılı günlərdən ibarət) bir ədədsən. Sənin bir günün getdiyi zaman, sənin bir parçan getmiş olur.”

* Bu cür deyərdi: “Bəkr ibni Abdullah əl-Muzəniyyinin bu cür dediyini eşitdim: ‘Əməl etmək üçün çox çalışın. Əgər zəiflik sizə mane olarsa günahlardan əl çəkin.’ ”

* Bu cür deyərdi: “Əməlinə riayət edən kimsə savaşda özünü müdafiə edən kimsə kimidir. Hətta əmələ riayət etməyin əcri daha üstün və daha çoxdur.”

***Ağılın və təfəkkür etməyin fəziləti haqqında:***

* Həsən bu cür deyərdi: “Kim ağıla sarılaraq hərəkət edərsə, təhlükədən əminlikdə olar. Aldanmış kimsə ağlını işlətməyəndir.”

* Bu cür deyərdi: “İnsan öz ağlı, həyası və yumuşaq xasiyyəti ilə (insanlara) hakim olur.”

* Bu cür deyərdi: “Ən üstün əməl: təfəkkür etmək və Allahdan haqqı ilə qorxmaqdır. Kimin həyatı bu cür olsa, o qurtular. Yoxsa öz həyatını hesaba çəksin.”

* Bu cür deyərdi: “Təfəkkür bir aynadır, o yaxşı əməllərini pis əməllərindən ayırıb sənə göstərir. Kim ona etimad etsə, müvəffəq olar. Kim də ondan qafil olsa, (pis əməlləri aşkara çıxarılıb) onu rüsvay edər.”

* Bu cür deyərdi: “Bir saat təfəkkür etmək gecə namaza durmaqdan daha xeyrlidir.”[40]

[40] Yəni burada Allahın ayələri və hökmləri üzərində düşünmək, ibrət almaq və təfəkkür etmək qəsd edilir.

## Dördüncü fəsil: Yaxşı əməl sahiblərinin sifətləri və bəzi saleh əməllər haqqında dediyi sözlər

***Möminin sifətiləri haqqında:***

* Bu cür deyərdi: “Möminin əməli onun sözünü, içi çölünü, görülən halı görünməyən halını doğrulayır. Münafiqin əməli sözünü, içi çölünü, görülən halı görünməyən halını yalanlayır.”

* Bu cür deyərdi: “İncə zəkaya sahib olan mömin o kəsdir ki, hər dəfə Allah ona olan lütfünü artırdıqca, onun da Allahdan olan qorxusu artar.”

* Ondan soruşuldu: “Ey Əba Səîd! Günah işləyən sonra tövbə edən və yenə günaha dönən kimsə barəsində nə deyirsən?!” Dedi ki: “Bunun möminlərin əxlaqından olduğunu bilmirəm. ”

* Bu cür deyərdi: “Mömin, ən gözəl əmələ sahib və insanlar içərisində Allahdan ən şiddətli qorxan kimsədir. Yer dolusu miqdarınca qızıl infaq etsə də, öz gözləri ilə görmədikcə (günahlarının bağışlanmasından və ya cəhənnəm atəşindən qurtulduğundan) əmin olmaz və hər zaman bu cür deyər: qurtulmaram, qurtulmaram. Münafiq isə bu cür deyər: (Günahkar) insanlar çoxdur, bütün günahlar içərisində mənim günahım nədir ki? Şübhəsiz ki, Allah ər-Rahimdir və məni bağışlyar.”

* Bu cür deyərdi: “Mömin möminin bir parçasıdır, hüzünləndiyi zaman o da hüznlənər, sevindiyi zaman o da sevinər.”

* Bu cür deyərdi: “Qiyamət günü Allah subhanəhu möminləri ehsanı və lütfü ilə hesaba çəkəcək, kafirlərə isə hüccəti və ədaləti ilə əzab verəcək.”

* Bu cür deyərdi: “Ey Adəm övladı! Şübhəsiz ki, mömin yaxşı əməllər görən kimsə olsa da qorxaraq sabahlayar. Ona bundan başqa bir halda olması da yaraşmaz, çünki o iki qorxu arasındadır:

1.Keçmiş günah: Allahın onun haqında nə edəcəyini (onu bağışlayacaqmı yoxsa əzab verəcəkmi) bilmir.

2. Qalan həyatı: Allahın onu nə ilə imtahan edəcəyini bilmir.

Düşünən və ibrət alan, bəsirətlə baxıb sonra anlayan və nəfsi arzulardan qoruyan qula Allah mərhəmət etsin!”

***Yaxşı əməl sahiblərinin sifətləri haqqında:***

* Bu cür deyərdi: “Rəsulullahın (səllahu aleyhi və səlləm) bu cür dediyi rəvayət edilir:

**“Ümmətimin vəli qulları cənnətə (heç də) namazlarının və oruclarının çoxluğu ilə girməyəcəklər. Lakin ora Allahın rəhməti və qəlblərinin təmizliyi ilə, nəfslərinin səxavətli olması və bütün müsəlmanlara qarşı mərhəmətli olması səbəbi ilə girəcəklər.”**[41]

* Bu cür deyərdi: “Ey insanlar! Allahın elə qulları var ki, onlar sanki cənnət əhlini cənnətdə nemətlərdən faydalanan halda, cəhhənnəm əhlini isə cəhənnəmdə əzab çəkən halda görən kimi idilər. Onlar gördükləri nemətlərdən ötrü (saleh) əməllər işləyirlər və acıverici (cəhənnəm) əzabından qorunmaq üçün günahlara son qoyurlar.

[41] İbnu Adiy, (2/289); Deyləmi, (1/231); Beyhaki, "Şuâbul İman, (10892)" – hədis zəifdir.

Ey insanlar! Yenə Allahın elə qulları var ki, onların qəlbləri hüzünlüdür, şərliləri əmindir, nəfsləri iffətlidir və könülləri incədir. Onlar uzun zamanları (yəni axirəti) ümid edərək, (sayı) az olan günlərə (yəni dünya həyatına) səbr edirlər. Gecələri ayaqda duraraq Rəblərinə yalvarарlar və boyunlarını (cəhənnəm atəşindən qurtarmağa) çalışarlar. Allah qorxusu səbəbi ilə gözlərindən yaşlar axar, qorxudan qəlbləri çırpınar. Gündüzləri isə hikmət sahibi, alim, təqva sahibi və hallarını gizləyəndilər. Belə ki, iffətlərindən dolayı ehtiyaclarını dilə gətirməmələri səbəbi ilə cahillər onları zəngin hesab edərlər. Allah qorxusundan dolayı onların xəstə olduğunu zənn edərsən, onlar isə xəstə deyillər, lakin cəhənnəm atəşini və əhlini çox xatırlamaları səbəbi ilə bu haldadırlar. Vallahi onlar özlərinə halal edilmiş şeylərdən sizin haram edilmiş şeylərdən çəkinməyinizdən daha çox çəkinərlər. Onlar sizin dünyanızı düşünməyinizdən daha çox dinlərini düşünərlər, onlar sizin günahlarınızdan dolayı əzab görəcəyinizdən qorxmağınızdan daha çox özlərinin yaxşı əməllərinin rədd olunmasından qorxarlar.

***«Onlar Allahın firqəsidirlər. Bilinki, həqiqətən Allahın firqəsi, məhz onlar qalib olanlardır.»*** **(Mucadilə, 22)**"

* Bu cür deyərdi: "Adamın mürüvvəti onun dilinin doğruluğu, qardaşının çətinliklərinə qatlanması, zamanındakı insanlara bol-bol yaxşılıqlar etməsi və qonşularına əziyyət verməkdən uzaq durmasıdır."

* Yenə bu cür deyərdi: "Mürüvvəti olmayan kimsənin dini də yoxdur."

* Və demişdir: "Əliaçıq insanın vədi işi yerinə yetirmək və cəldlikdir, xəsisin vədi isə sonraya saxlamaq və işi uzatmaqdır."

* Bu cür deyərdi: “Xeyir əhlinin tanındığı bəzi əlamətləri var: doğru sözlü, əmanəti yerinə yetirən, əhdə vəfa edən, qürur və kibri az olan, qohumluq əlaqələrini saxlayan, zəiflərə rəhm edən, bol-bol yaxşılıq edən, gözəl əxlaqlı, çox yumşaq (xasiyyətli) olan, elmi yayan və qadınlarla az oturub qalxandır.”

* Bu cür deyərdi: “Rəsulullahın (sallallahu aleyhi və səlləm) bu cür dediyi rəvayət edilir:

**“Dünyada xeyirxah olanlar axirətdə də xeyirxahdırlar.”** [42]

Bu onların dünyada insanlara etdikləri yaxşılıqlarına görə Allah azzə və cəllənin onların günahlarını bağışlamasına görədir. Sonra isə qiyamət günü onlara belə deyəcək: Öz həsənətlərinizi[43] dilədiyiniz kimsəyə bəxş edin, artıq sizin üçün seyyiətlərinizi[44] bağışladım. Onlar da həsənətlərini bəxş edəcəklər və beləcə dünyada olduqları kimi axirətdə də xeyirxah insanlar olacaqlar.”

* Bu cür deyərdi: “Qul xərclədiyi hər bir şeydən dolayı mütləq hesaba çəkiləcək. Yalnız valideynlərinə və onlardan başqasına və ya Allah yolunda qardaşına və ya Allaha itaətdə dostuna sərf etdiyi xərc istisnadır. Rəvayət edildiyinə görə Allah subhanəhu təala (qulunu) bunlardan dolayı hesaba çəkməkdən həya edər.”

* Bu cür deyərdi: “Əxlaqı pis olan özünə əzab edər, malı çox olanın günahları çoxalar, çox danışanın isə eyibləri çoxalar.”

---

[42] Hədis səhihdir. Hədisi Təbərani "Mucəmus-Sağir, (199)"-də rəvayət etmişdir: **“Dünyada xeyirxah olanlar axirətdə də xeyirxahdırlar. Dünyada pis əməl sahibləri axirətdə də pis əməl sahibidilər.”**
Alimlər pis əməl sahiblərinin axirətdə də pis əməl sahibi olmalarını bu cür şərh ediblər: Onlar gördükləri pis işlərə görə əzab görəcəklər və Rəsulullahın (sallallahu aleyhi və səlləm) şəfaətinə nail olmayacaqlar.

[43] Həsənət, yəni savablar, yaxşılıq, itaət və xeyrli əməllərə deyilir.

[44] Seyyiət, yəni günahlar, pis və münkər əməllərə deyilir.

* Bu cür deyərdi: “Yaxşı qonşuluq qonşuya əziyyətdən qaçınmaq deyil, yaxşı qonşuluq yalnız edilən əziyyətə qatlanmaqdır.”

* Bu cür deyərdi: “Dörd şey var ki, kimdə olarsa, o kamil insan olar. Kim əgər bunlardan birisinə yapışarsa, öz qövmünün salehlərindən olar:

1. Ona doğru yolu göstərən din və ya
2. Onu doğruldan ağıl və ya
3. Onu qoruyan şərəf və ya
4. Onu ucaldan həya.”

* Bu cür deyərdi: “Ey Adəm övladı! Allahın haram etdiklərindən uzaq dur ki, abid[45] bir kimsə olasan, Allahın qismət etdiyinə razı ol ki, zəngin olasan. Sənə qonşu olana yaxşı qonşuluq et ki, mömin olasan, özün üçün sevdiyini insanlar üçün də sev ki, adil olasan. Gülməyi azalt, həqiqətən də o, bədənin ölməsi kimi qəlbi öldürür.”

* Bu cür deyərdi: “Dörd şey kimdə olsa, Allah onu cənnətə daxil edər və rəhmətini onun üzərində yayar:

1.Valideynlərinə yaxşılıq edən,
2. Köləsinə şəfqətli olan,
3. Yetimə kəfil olan və
4. Zəifə yardım edən.”

* Bu cür deyərdi: “Dörd şey var ki, kimdə olarsa Allah azzə və cəllə onu şeytandan qoruyar və cəhənnəm atəşindən mühafizə edər:

1. Qorxu,
2. (Aşırı) istək,
3. Hiddət və

---

[45] Abid: qulluq edən, itaətkar qul, davamlı ibadət edən deməkdir.

4. Şəhvət anlarında öz nəfsinə sahib olan kimsə.”

* Bu cür deyərdi: “Aqil kimsə bir nəfərin düşmənçiliyini min nəfərin sevgisi ilə almaz. Əgər bunu edərsə, ziyana düşər və qazanmaz.”

* Rabî ibni Subayh[46]ın ondan bu cür soruşduğu rəvayət edildi: “Ey Əba Səîd! İşa namazından sonra on rəkət namaz qılmaq barəsində nə deyirsən, o tatavvûdur[47] yoxsa sünnədir?” Dedi ki:
“O sünnə deyil, əgər sünnət olsaydı, müsəmanın onu tərk etməsi mümkün olmazdı. Lakin ey qardaşımın oğlu! Öz nəfsini xeyrə qarşı adət halına gətirdiyi zaman işində davamlı olması və ya Allaha etdiyi ibadətdə səbat etməsi və vaxtını onu yerinə yetirməklə keçirməsi müsəlman qulun ədəbindəndir.”

* Yenə bu cür deyərdi: “Allah sizə rəhm etsin! Allahın ədəbi ilə ədəblənin və Allahın Kitablarındakıları qoruyun ki, Onun vəli qullarından olasınız.”

* Bu cür deyərdi: “Ən qiymətli olan şeylər bunlardır: halal dirhəm (yəni qazanc) və Allah üçün olan qardaş; əgər dünya işində onunla istişarə etsən, onun sağlam fikirə sahib olduğunu görərsən. Əgər dinində onunla istişarə etsən, onun bəsirətli olduğunu görərsən.”

* Bu cür deyərdi: “Məscidləri süpürmək və zikr ilə təmir etmək hurilərin mehridir.”

* Bu cür deyərdi: “Cənazələrə qatılmağa istəkli olun. Şübhəsiz ki, onda üç əcir var: başsağlığını dinləyən üçün əcir, cənazə namazı qılan kimsə üçün əcir və dəfn edən üçün əcir. Rəvayət edilmişdir ki: Kim

---

[46] O, Rabî ibni Subayh əs-Sâdi əl-Bəsridir. Bəsrənin tanınmış şeyxlərindən idi, Hindistanın fəthi zamanı gedən döyüşlərin birində, hicrətin 160-ci ilində vəfat etmişdir.

[47] Tatavvû – vacib olmayan bir şeyi könüllü olaraq və öz ixtiyarı ilə yerinə yetirməkdir.

dəfn edilən cənazəyə qatılarsa onun yetmiş böyük günahı bağışlanar.”

* Bu cür deyərdi: “Üç şeydə şirinliyi axtar:

1. Namazda,
2.(Quran) oxumaqda və
3. Zikrdə.

Əgər bunu tapsan, davam et və sevin. Əgər tapmasan, bil ki, sənin qapın bağlıdır və onu açmağa çalış.”

* Bu cür deyərdi: “Bu ümmətin xeyirliləri şərlilərinə yumuşaq davranmadıqca, yaxşıları günahkarlarını təzim etmədikcə, qurraları[48] əmirlərinə meyl etmədiyi müddətcə onlarda xeyr olmağa davam edəcək və onlar Allahın rəhməti, qoruması və himayəsi altında olmağa davam edəcəklər. Bunları etdikləri zaman isə Allah əlini onların üzərindən çəkəcək və onlara ağır əzablar verən zalimləri üzərilərinə musallat edəcək. Axirət əzabı isə daha acı verici və daha qalıcıdır. Həmçinin onların qəlblərinə qorxu salınacaq.”

* Bu cür deyərdi: “Axmağı tərk etmək Allaha yaxınlaşdıran gözəl əməldir, aqil kimsə ilə münasibəti davam etdirmək isə Allahın dinini yerinə yetirməkdir. Möminə ikram etmək Allah üçün xidmət etməkdir, fasiqdən əlaqəni kəsmək isə Allahdan bir yardımdır.”

* Bu cür deyərdi: “Tatavvû ibadətlərdən heç bir şey; nə həcc, nə də ki, cihad valideynlərə yaxşılıq etməyə tay deyildir.”

* Yenə demişdir: “Anan ilə onun gözünü aydınlatacaq axşam yeməyini birlikdə yeməyin sənin tatavvû olaraq etdiyin həccdən mənə daha sevimlidir.”

* Bu cür deyədi: “Peyğəmbərin (səllalahu aleyhi və səlləm) bu cür

[48] Qurra, Quranı çox oxuyanlara deyilir.

dediyi rəvayət edilir:

**“Dilin sədəqəsindən üstün sədəqə yoxdur.”**

Soruşuldu ki: ‘Ey Allahın Rəsulu! Dilin sədəqəsi nədir?’ Dedi ki:

**“Gözəl vasitəçlikdir, Allah onunla pis şeyləri gizlədər, ehtiyacı yerinə yetirər və sıxıntıdan qurtarar.”**

***İman haqqında:***

* Bu cür deyərdi: “Ey Adəm oğlu! Həqiqətən iman nə (zahiri əməllərlə və sözlərlə) bəzənməklədir, nə də təmənni ilə deyildir. Lakin o, qəlbə yerləşən bir şeydir, əməllər isə onu doğrulayır.”

***Gecə namazı haqqında:***

* Bu cür deyərdi: “İbadətlərdən gecənin ortasında qılınan namazdan daha çətin olan bir şey görmədim. Həqiqətən o, müttəqilərin əməllərindəndir.”

* Bu cür deyədi: “Bir qoyun və ya bir dəvə sağılacaq qədər gecə namazı qılmaq müsəlmanların üzərinə fərzdir.”

* Bir gün bir adam ondan soruşdu:

“Ey Əba Səîd! Nə üçün təhəccüd namazını qılanlar insanlar içərisində ən gözəl üzə sahibdirlər?!” Dedi ki:
“Çünki onlar Rəhmanla xəlvətdə qaldılar, O da onlara Öz nurundan geyindirdi və həmin nur onların üzlərində ortaya çıxmaqdadır.”

* Bu cür deyərdi: “Gecə namazına durmağa və gündüz orucunu tutmağa qadir olmadığın zaman, bil ki, sən məhrum olmusan. Günahların və xətaların artıq səni zəncirləmişdir.”

* Bu cür deyərdi: “Şübhəsiz ki, insan günah işləyər və onun səbəbi ilə gecə namazından məhrum olar.”

* Bir nəfər ona dedi: “Ey Əba Səîd! Gecə namazı qarşısında çarəsizəm, onun üçün gecələr qalxmağa güc yetirə bilmirəm." Dedi ki: "Ey qardaşımın oğlu! Allahdan bağışlanma dilə və Ona tövbə et! Həqiqtən də, bu pis əlamətdir!”

* Bu cür deyərdi: “Yuxu insanı yaxşı əməldən əngəlləyir, sizdən kim (yuxu səbəbi ilə) yaxşı əməli qaçırmaqdan qorxarsa gecə gəzsin.”[49]

* Rəvayət edilir ki, bir gecə Həsən namaz qılmağa çalışdı və nəfsi ona tabe olmadı. O, da başqa gecə səhərə kimi yatmayaraq oturdu. Ondan bunun səbəbi soruşulduqda bu cür dedi:

“Namazı tərk etməkdə nəfsim mənə qələbə çaldı, mən də ona yuxunu tərk etməyimlə qələbə çaldım. Allaha and olsun ki, o mənə boyun əyib və tabe olana kimi bu cür etməyə davam edəcəm.”

* Bu cür deyərdi: “Həqiqətən də nəfs insanı pis şeyə təşviq edir. Əgər o, sənə itaətdə üsyan etsə, sən də ona günahda üsyan et!”

* Rəvayət edilir ki, Həsən günorta vaxtı qaylulə[50] etməyən insanları gördü və dedi: “Onlar nə üçün qaylulə etmirlər? Mən onların

---

[49] Yəni yaxşı əməl etməyə niyyət edən bir insana yuxu mane olarsa, yuxunu dağıtmaq üçün gəzişsin. Məsələn gecə namazı qılmaq istəyənə yuxu əngəl olarsa, qalxıb gəzsin. Bu onun yuxusunu qaçırtmağa səbəb olacaq və gecə namazını qılmağa yardımçı olacaq.

[50] Qaylulə günorta yuxusunun adıdır. Peyğəmbərimiz (sallallahu aleyhi və səlləm) günorta vaxtı qaylulə yuxusu etməyi tövsiyə etmişdir. Qaylulə yuxusu gecə oyanmağa və gecə namazını qılmağa kömək edir.

gecələrinin pis bir gecə olduğunu hesab edirəm.”[51]

* Bu cür deyərdi: “Belin bükülənə kimi gecə namazı qılsan da, bədənin xəstə olana kimi gündüz oruc tutsan da, sadiq təqvaya sahib olmadan bunların sənə faydası olmaz.”

---

[51] Yəni onlar gecə oyanmalarına və namaz qılmalarına yardımçı olan qaylulə yuxunu etmədiklərinə bununla gecələri ibadətsiz keçirdikləri zənn edilir. Peyğəmbər (sallallahu aleyhi və səlləm) hədisi-şərifdə buyurmuşdur:

**“Qaylulə edin, çünki şeytan qaylulə etməz.”**

# Beşinci fəsil: Qardaşlıq sevgisi haqqında dediyi sözlər:

* Həsənin (rahiməhullah) bu cür dediyi rəvayət edildi:

"Müsəlman bir qardaşımın ehtiyacını yerinə yetirmək mənə bir ay etikafa girməkdən daha sevimlidir."

* Bu cür deyərdi: "Biz aramızda qardaşına dirhəmi borc olaraq verən kimsələri xəsis sayardıq. Çünki mallarımızı paylaşaraq və qardaşımızı öz nəfsimizdən üstün tutaraq bir-birimizlə rəftar edərdik. Vallahi, mən elə insanlar gördüm ki, onlardan biri öz paltarını iki yerə bölərdi, yarısını (istifadə etməsi üçün) qardaşına verərdi, qalanını isə özünə saxlayardı.

Sizdən öncə yaşayanlardan bir adam oruc tutardı, iftar vaxtı gələndə qardaşlarından bəzisinin evinə gedər və deyərdi: 'Mən bu gün Allah üçün oruc tutdum. Əgər Allah onu məndən qəbul edərsə, onda sənin də bir payının olmasını istəyirəm. Qalx axşam yeməyindən bir şey gətir yeyək.' O da su, xurma kimi gücünün çatdığı şeylərdən gətirərdi və ona iftar yeməyi verərdi. Bununla qardaşına əcir qazandırardı."

* Bu cür deyərdi: "Mən elə bir topluluqla qarşılaşdım ki, onlardan birisi ölümündən sonra qırx il ailəsinin və övladlarının (himayəsi üçün) geriyə (din) qardaşını buraxardı."[52]

* Bu cür deyərdi: "Adam dostunun evinə daxil olduğu zaman, ondan izin almadan süfrəyə gətirilən yeməkdən və meyvədən yeməsində bir

---

[52] Yəni həmin topluluqdakı insanlar birbirlərinə o qədər güvənirdilər ki, öldükdən sonra ailələrini və övladlarını qardaşlarına əmanət edirdilər.

problem yoxdur.”

* Bu cür deyərdi: “Adamın qardaşı üzərindən qazanc əldə etməsi mürüvvətdən deyildir.”

* Yenə cür deyərdi: “Mən elə insanlarla qarşılaşdım ki, onlardan heç biri sahib olduqları dinar və dirhəmə özünün (din) qardaşından daha çox haqq sahibi olduğunu düşünməzdi. Bəs sizə nə olub, ey insanlar?! Dolayısı ilə qınanacağınız və hesaba çəkiləcəyiniz şeyləri daşıyırsınız?!”

* Ondan rəvayət edildi ki, Ömər ibni Xattab (Allah ondan razı olsun) bu cür deyərdi: “Qardaşınla qarşılaşdığında salama ilk başlamağın, onu sevdiyi adlarla çağırmağın və məclisdə ona yer ayırmağın, həmin qardaşına olan sevgində səmimi olmağının göstəricilərindəndir.”

* Bu cür deyərdi: “Öz din qardaşına qarşı müsəlmanın üzərinə dörd şey vacibdir:
1. Onlardan yaxşılıq etməyi sevənlərə yardım etmək,
2. Dəvətlərinə qarşılıq vermək,
3. Günahkarlarına bağışlanma diləmək və
4. (Haqqdan) dönənləri haqqa dəvət etmək.”

* Bu cür deyərdi: “Kim müsəlman qardaşının istəyində həmfikir olarsa və ya onun ehtyacını yerinə yetirərsə, keçmiş günahları bağışlanar.”

* Bu cür deyərdi: “Rəvayət edildi ki, qiyamət günü carçı bu cür səslənəcək: ‘Kimin Allahdan əcri varsa qalxsın.’ Qardaşının ehtiyacını ödəyən və ya etdiyi haqqsızlığa görə onu bağışlayan və ya ona yaxşılıq göstərən kimsədən başqa heç kim qalxmayacaq.”

* Həsən bir nəfərin başqası ilə haqq-hesab etdiyini və ona  bu cür

dediyini eşitdi: “Sənin mənə 1 dəniq[53] verəcəyin qaldı.” Həsən dedi:

“Bir-birinizi xırdaçıqla hesaba çəkməyin ki, Allah da sizi xırda işlərinizdən dolayı hesaba çəkməsin. Allah dəniqə və onunla hesaba çəkənə lənət etsin!”[54]

* Bu cür deyərdi: “Bizə nə olur ki, birimiz öz qardaşı ilə qarşılaşanda ondan halını soruşmur və onun üçün bu cür dua etmir: 'Allah bizi və səni bağışlasın, bizi cənnətinə daxil etsin.' Əgər məsələ dinar və dirhəm olarsa, heyhat ?! Vay sizin halınıza! Sizin saleh sələfiniz bu cür etməzdi. Nə üçün onları örnək almağı tərk etdiniz, axı siz onunla əmr olunmusunuz ?!”

* Bu cür deyərdi: “Ey insanlar! Bizə nə olur ki, dinclikdə bir-birimizə yaxın oluruq, müsibət anında isə bir-birimizdən ayrılırıq?! Allah Rəsulunun (sallallahu aleyhi və səlləm) əshabı bu cür deyildi. Onlara müxalif olmaqdan Allaha sığınırıq.”

* Bu cür deyərdi: “Müsəlman öz dərdini müsəlman qardaşına şikayət etməzsə, bəs kimə şikayət edər? Qardaşının ehtiyacı olduğu bir şeyi, öz ehtiyacı kimi qəbul edib lazım olanı etməzsə, bəs kim onu edəcək? Şübhəsiz ki, müsəlman öz müsəlman qardaşının güzgüsüdür, ona eybini göstərər və günahını bağışlayar. Sizdən öncə sələfi salehdən bir adam başqası ilə qarşılaşanda bu cür deyərdi:

‘Ey qardaşım! Mən günahlarımın hamısını görmürəm və eyiblərimin hamısını bilmirəm. Əgər bir xeyir görsən mənə əmr et,

---

[53] Dəniq, dinarın və dirhəmin altıda biridir. (Lisanul Arab, 10/105)

[54] Başqa bir rəvayətdə bu cür demişdir: “Dəniqlə xırdaçılıq edənə və ilk dəfə onu icad edənə Allah lənət etsin.”
Sanki bununla çox dəyərsiz və qiymətsiz şeylərə baxmağı və incələməyi qadağan etməyi istəmişdir. (Lisanul Arab, 10/105)

bir şər gördükdə isə mənə qadağan et.’

Ömər ibni əl-Xattab (Allah ondan razı olsun) deyərdi:

‘Qüsurlarımızı bizə bildirən kimsəyə Allah rəhm etsin!’

Onlardan birinə qardaşı nəsihət etdiyi zaman nəsihətini qəbul edərdi və onunla faydalanardı.”

* Bu cür deyərdi: “Sənin dostundan alacağın bir nəsibin var, elə isə özünə qardaşlar və yoldaşlar seç, qınanılacaq işi də özündən uzaqlaşdır.”

# Altıncı fəsil: Dünyanı pisləməsi və ona bağlanmaqdan çəkindirməsi haqqında dediyi sözlər

***Dünyanın bir tələ olmasından qorxmaq:***

* Hişam ibni Hassan dedi: Həsənin bu cür dediyini eşitdim:

"Vallahi! İnsanlardan elə birisi yoxdu ki, Allah onun üçün dünya işlərindən birini asanlaşdırdığında onun bir tələ olmasından və onun üçün bir istidrac[55] olmasından qorxmazsa, bu mütləq onun əməlini, dinini və ağlını naqis etmiş olar. Və elə birisi olmaz ki, Allah onu dünyadan məhrum etdiyində, o, bunun onun üçün xeyir olduğunu

---

[55] İstidrac ərəb lüğətdə tədricən, dərəcə-dərəcə, mərhələ-mərhələ, addım-addım irəliləmək və ya almaq və ya ələ keçirmək, bir dərəcədən başqasına yüksəlmək, möhlət vermək və aldatmaq kimi mənalara gəlir. Həmçinin istidrac, Allahın sevmədiyi bir quluna işlədiyi günahlara baxmayaraq ona bəxş etdiyi nemətlərini və imkanları artırmasıdır. Əslində bununla onun günahını artırmaqla tədricən əzaba yaxınlaşdırır. *"Tacul-Arus"*-da deyilmişdir: Allahın qulunu istidrac etməsi o deməkdir ki, qul hər dəfə xətasını təkraraladıqca, Allah da ona yenidən nemət bəxş etməklə bağışlanma diləməyi ona unutdurar. Allah Quranda buyurmuşdur:

***«Ayələrimizi yalan sayanları, özləri də bilmədən tədricən (yaxalayıb) əzaba götürəcəyik»*** **(Əraf, 182)**

***«Bu sözü yalanlayanları Mənə burax. Biz onları özləri də bilmədən tədricən (yaxalayıb) əzaba götürəcəyik»*** **(Qaləm, 44)**

İstidrac yalnız kafirlərə məxsus bir şey olmayıb, müsəlmanlara da aid edilə bilər. Uqbə ibni Amirdən rəvayət edilən hədisdə Allah Rəsulu (sallallahu aleyhi və səlləm) demişdir:

"Allahın günah işləyən quluna şevdiyi şeyləri verdiyini görsən, (bil ki,) bu ancaq istidracdır." Sonra Rəsulullah (sallallahu aleyhi vəsəlləm) bu ayəni oxudu:

***«Onlara edilmiş xəbərdarlığı unutduqları zaman hər şeyin qapılarını onların üzünə açdıq. Özlərinə verilən şeylərə sevindikləri vaxt onları qəflətən yaxaladıq və onlar ümidsiz qaldılar»*** **(Ənam, 44)**

görməzsə, bu mütləq onun əməlini, dinini və ağlını naqis etmiş olar və düşüncəsinin dar olduğu açığa çıxar.”

* Bu cür deyərdi: “Allah (azzə və cəllə) bəzi qullarını tələyə düşürmək üçün dünyanı onlara verər. Bəzilərinin isə halına nəzər salaraq dünyanı onlardan əngəlləyər.”

* Bu cür deyərdi: “Hər gün ruzi bəxş edilən elə bir müsəlman olmaz ki, bunun onun üçün bir xeyir olduğunu bilməməsi onun yalnız dar düşüncəli olmağından dolayı olmasın.”

***Dünya, halalında hesab, haramında cəza olan bir yerdir:***

* Bir adam ona dedi: “Ey Əba Saîd! Dünya haqqında nə deyirsən?"
O isə dedi: "Halalının hesabı, haramının isə cəzası olan bir yer haqqında nə deyə bilərəm ki?”
Adam dedi: “Allaha and olsun ki sənin kəlamından daha yığcam və mənalı bir kəlam görmədim.”
Həsən dedi: “Əksinə Ömər ibni Abduləzizin kəlamı mənimkindən daha yığcam və daha bəlağətlidir. Belə ki, Humusun valisi ona yazmışdı: 'şəhərin divarları bir-bir yıxılır, təmirə ehtiyacı var.' O isə cavabında ona yazdı:
“Şəhərini ədalətlə qoru, onu zülmdən təmizlə, onu qorxulardan güvənlikdə tut və onun üçün əmin-əmanlığı ümid et.”

***Allah dünyanı yalnız imtahan etmək üçün verər və əngəlləyər:***

* Bu cür deyərdi: “Ey Adəm övladı! Allah dünyanı sənə yalnız imtahan olaraq vermişdir və onu yaratdığı gündən bəri mömin qullarından yalnız imtahan olaraq əngəlləmşdir.”

***Dünyanı bir əmanət kimi görmək:***

* Bu cür deyərdi: “Dünyanı yanlarında buraxılmış bir əmanət kimi görən, hətta onu sahibinə təslim edib sonra ağır halda deyil xəfif bir yüklə çıxıb gedən insanlara Allah mrhəmət etsin! Mən elə insanlarla qarşılaşdım ki, onlardan birisinə dünya ərz edilsə, o, çox çalışıb ehtiyacı olmasına baxmayaraq, Qiyamət saatının qorxusundan onu tərk edərdi.”

***Dünyada zühd əhli olmaq:***

* Bu cür deyərdi: “Dünyada zühd əhli olanlar xaric qiyamət günü insanlar çılpaq şəkildə həşr olunacaqlar.”

* Bu cür deyərdi: “Ey insanlar! Dünyada zahid olun! İsanın (aleyhissəlam) bu cür dediyi rəvayət edilir:

"’Aclığım qatışıqdır[56], şüarım isə qorxudur, libasım yundur, qışda isindiyim atəş günəşdir. Çırağım aydır, miniyim ayaqlarımdır, meyvəm isə yerin bitirdikləridir. Allah bilir ki, mən heç bir şeyim olmadığı halda gecələyir və heç bir şeyim olmadığı halda sabahlayıram, halbu ki yer üzündə məndən zəngin kimsənin olmadığını hesab edirəm.”

***Dünya sevgisi:***

* Bu cür deyərdi: “Vallahi! Dünya sevgisini böyük günahlardan hesab etməyən adama olan təəccübüm kimi heç bir şeyə təəccüb

---

[56] Yəni çörəklə yeyilən zeytun, pendir və s. kimi əlavə şeylər.

etmədim. Allaha and olsun ki, onun sevgisi böyük günahlardandır. Məgər ondan başqa bir şeydən ötrümü böyük günahlar qisimlərə ayrıldı? Məgər bütlərə və Rəhmana üsyan dünya sevgisindən başqa bir şey üçünmü edildi? Arif kimsə onun dəyərsizliyindən ötrü narahat olmaz, yaxınlığına görə yarışmaz və uzaqlığına görə üzülməz."

* Həmçinin demişdir: "Adəm övladları dünyanı sevdikləri zaman, artıq onların bütə ibadət etməmələrinə və Allahdan başqa ilahı özlərinə rəb götürməmələrinə heç əhəmiyyət verməm. Onların dünya sevgisi təhlükəli hallara səbəb olacaqdır."

* Bu cür deyərdi: "Ey insanlar! Vallahi, dirhəmi uca tutan elə kimsə yoxdur ki, qiyamət günü Allahu təala onu zəlil etməsin. Deyilənə görə dinar və dirhəm (ilk dəfə) kəsildiyi zaman İblis onu uca tutdu, başının üstünə qoydu və dedi: 'Sizin ikinizi kim sevsə, o, gerçəkdən mənim köləm olar və istədiyim kimi onu yönləndirərəm.' "

* Bu cür deyərdi: "Kim Rəbbini tanıyarsa, Onu sevər və Onun qatındakını üstün tutar. Kim də dünyanı və onun aldatmasını tanıyarsa, ondan əlini çəkər."

***Dünyanı dəyərsiz görmək:***

* Bu cür deyərdi: "Elə insanlarla qarşılaşdım ki, dünya onlar üçün üzərində gəzdikləri torpaqdan daha dəyərsiz idi."

* Bu cür deyərdi: "Ey İnsanlar! Elə insanlarla rastlaşdım və elə camaatlarla yoldaşlıq etdim ki, onlara dünyalıqdan bir şey gələndə sevinməzlərdi və ondan bir şey çıxıb gedəndə üzülməzlərdi. Onların yanında dünya sizin üzərinə ayaqlarınızı basdığınız torpaqdan daha dəyərsiz idi.

Onlardan biri yaşadığı ömür içində paltarı yenilənməzdi, atəşinin

üzərinə qazan qoyulmazdı və onunla yer arasında heç bir örtü olmazdı. Onlar gözlərin bərələcəyi və qəlblərin kor olacağı (qiyamət) günündən qorxarlardı.”

* Həsən ibni Cəfər dedi: “Malik ibni Dinarın bu cür dediyini eşitdim:

‘Dinar və dirhəm meyvə çəyirdəyindən daha dəyərsizdir.’

Bunu Həsənə bildirdim və o dedi:

“Allah Malikə rəhmət eləsin! O ikisi (yəni dinar və dirhəm) mənim üçün xırda daşlardan da dəyərsizdir. Çəyirdəyi heyvanlar yeyir və insanlar ondan faydalanır. Dirhəmlər isə onu halal olmayan yolla qazananı öldürür və cəhənnəm atəşinə salır, necə də pis dönüş yeridir.”

* Ondan soruşuldu: “İnsanlar içərisində dəyəri ən çox olan kimdir?" Dedi ki: "Özü üçün dünyanın heç bir dəyərinin olmadığını görən kimsədir.”

***Dünya əməli ilə axirət qazanılmaz:***

* Bu cür deyərdi: “Axirət əməli ilə dünyanı qazanan kimsə gördük, dünya əməli ilə axirəti qazananı isə görmədik.”

***Dünya İblisin tarlasıdır:***

* Bu cür deyərdi: “Məsihin (yəni İsa aleyhissəlamın) bu cür dediyi rəvayət edilir:
‘Dünya İblisin tarlasıdır, insanlar isə onun əkinçiləridir.’ “

***Nə üçün dünyada Allah azzə və cəlləni görmək mümkün deyil?***

* Ondan soruşuldu ki: “Ey Əba Saîd! Dünya yurdunda biz Allah azzə və cəlləni görə bilərikmi?”
Dedi ki: “Xeyr.”
Soruşdular ki: “Bəs axirət yurdunda görəcəyikmi?”
Dedi ki: “Bəli.”
Soruşdular ki: “Bəs bu ikisi arasındakı fərq nədir?”
Dedi ki: “Şübhəsiz ki, dünya fanidir və içindəki hər şey də fanidir. Axirət isə əbədidir və içindəki hər şey də əbədidir. Əbədi olanın fani olan ilə və əzəli qədim olanın sonradan ortaya çıxan bir şey ilə görünməsi imkansızdır. Qiyamət günü olanda Allah azzə və cəllə qulları üçün Rəblərinə baxacaqları əbədi gözlər yaradacaqdır. Bunu onlara bir lütf və ikram olaraq edəcəkdir.”

***Qəlbi dünyaya bağlamamaq:***

* Bu cür deyərdi: “Ey Adəm övladı! Qəlbini dünyadan heç bir şeyə bağlama, onun bağlılığı ən şərli bağlılıqdır. Onun bağlarını kəs və qapılarını bağla.
Ey aldanmış (insan)! Ondan mənzilinə çatdırcaq qədəri sənə kifayət edər. Qiyamət günü malın və övladınla qürurlanacağını zənn etməkdən çəkin! Hesaba çəkiləcək bir gündə ondan bir şeyin sənə fayda verməsi necə də imkansızdır! O elə bir gündür ki, onda dünya bütün halıyla gedər və (yaxşı) əməl sahiblərinin əməllərinin boyunbağıları ( yəni mükafatları) isə boyunlarında qalar.”

* Bu cür deyərdi: “Qəlbdə dünya olduğu zaman, axirət ondan qaçar. Çünki o, çox dəyərli və qiymətlidir.2

* Bu cür demişdir: “Əgər dünyadan istədiyin sənə kifayət edən bir

şeysə, onun ən azı sənə yetər. Əgər ondan əməl etdiyin şey sənə kifayət etmirsə, o zaman sənə yetəcək bir şey yoxdur.”

***Dünyanı tərifləyən axirəti pisləmiş olar:***

* Bu cür deyərdi: “Kim dünyanı tərifləsə, axirəti pisləmiş olar. Yalnız Allahın qəzəbi üzərində qalan kimsə Onunla qarşılaşmamağı istər.”

***Dünyanı axirətdən üstün tutmamaq:***

* Bu cür deyərdi: “Ey Adəm övladı! Sənin üçün keçici olan və vəd edilmiş var. Keçici olanı vəd edilmiş olandan üstün tutma, yoxsa peşman olarsan. Bil ki, əgər dünyanı axirətinə satsan, hər ikisini qazanarsan, əgər axirətini dünyana satsan ikisini də itirərsən.

Ey Adəm övladı! Axirətin üçün xeyirli bir şey saxlanılıbsa, dünyandan bir şeyin əngəllənməsi sənə zərər verməz. Axirətinin xeyirindən məhrum olmusansa, (dünyada) əldə etdiyin xeyirin bir faydası olmaz.

Ey Adəm övladı! Dünya bir minikdir, əgər ona minsən səni daşıyar, əgər sən onu daşısan, sənə ağır olar.”

* Həmçinin deyərdi: “Ey Adəm övladı! Əgər insanları xeyir içində görsən, onlarla yarış. Əgər onları dünyanı tələb etməkdən ibarət bir həlakın içərisində görsən, onları və özləri üçün seçdiklərini burax. Mən elə qövmlər gördüm ki, keçici olanları vəd edilmiş olanlardan və dünyalarını axirətlərindən üstün tutdular. Daha sonra rüsvay, zəlil, həlak oldular və qəlblərinin ölməsi ilə cəzalandırıldılar.”

* Bu cür deyərdi: “Kim səninlə dinində yarışarsa, onunla yarış. Kim səninlə dünyalıq bir şeyində yarışarsa, onu öz başına burax.”

***Dünya sanki bir yuxudur:***

* Bu cür deyərdi: “Bəkr ibni Abdullah bu sözü dediyi vaxt ona afərin olsun:

‘Dünyadan ötüb keçənlər (sanki) bir yuxudur, ondan geriyə qalanlar isə arzular və günahlardır.’ ”

***Dinini dünyasına dəyişən alimlərin cəzası:***

* Bu cür deyərdi: “Axirət əməli ilə dünyanı istəmələrinə görə alimlərin cəzası qəlblərinin ölməsidir.”

***Peyğəmbərin (səllalahu aleyhi və səlləm) dünyanı önəmsəməməsi:***

* Həsən demişdir: “Rəsulullah (sallallahu aleyhi vəsəlləm) uzunqulağa minərdi, yun geyinərdi, (yeməkdən sonra) barmaqlarını yalayardı və yerdə (oturub) yemək yeyərdi. Aleyhissəlam bu cür buyurur:

**‘Mən sadəcə bir bəndəyəm, (hər bir) bəndə kimi yeyirəm.’[57] ”**

* Həsən bu cür deyərdi: “Rəvayət edilir ki, rəsulullah (sallallahu aleyhi və səlləm) bəzi günlərindən danışarkən demişdir:

**“Muhəmmədin nəfsi əlində olana and olsun ki, bu gün**

---

[57] Əhməd, "Zühd, s.11"; Bəğavi, "Şərhus-Sünnə, (11/287)"

**Muhəmmədin ailəsində heç bir yemək olmadı.' Həmin vaxt onlar doqquz ailə idilər.”**[58]

Həsən dedi: “Vallahi o, (sallallahu aleyhi vəsəlləm) bunu nə Rəbbinin ruzisinin gəlməsini yavaş saydığına görə, nə də ona vermədiyi bir şeyi tələb etdiyinə görə demədi. Lakin bunu ümmətinin onu örnək almasına görə və dünyanın onun yanında heç bir qiymətinin olmadığını bilməsinə görə dedi.”

* Bu cür deyərdi: “Rəsulullaha (sallallahu aleyhi və səlləm) dünyanın açarları və yerin xəzinələri ərz edildi. Allah bununla onun əcrindən heç bir şey əksiltməz, o, isə onları qəbul etməyi rədd etdi və Rəbbinə müxalif olmağı, Onun sevmədiyi bir şeyi sevməyi və ya dəyərini düşürdüyü bir şeyi yüksəltməyi xoş görmədi. Onun (sallallahu aleyhi və səlləm) bu cür dediyi rəvayət edilmişdir:

**“Kim dünyanı tərk edərsə, müsibətlər ona asan gələr.”"**[59]

***Dünya ilə cənnət qazanılmaz:***

* Bu cür deyərdi: “Ey insanlar! Şübhəsiz ki, Allah nə cənnəti ilə aldatılmaz, nə də onu (sadəcə) arzulardan dolayı qullarından heç kimə verməz.”

***Mömin dünyada əsirdir:***

* Həsən bu cür deyərdi: “Mömin dünyada əsirdir, azad olmağa çalışar, Allah ilə qarşılaşına kimi əminlikdə olmaz.”

---

[58] Əhməd, "Müsnəd, (3/238)"; Əhməd, "Zühd, s.10" – həmin vaxt peyğəmbərimizin (sallallahu aleyhi və səlləm) doqquz xanımı var idi.

[59] Hədis zəifdir. İbnul Cövzi, "əl-Məvzuât, 3/180"-da hədisin səhih olmadığını bildirmişdir.

***Dünyaya nifrət emək vacibdir:***

* Həsən bu cür deyərdi: “Qul sabahladığı zaman dörd şey ona vacib olar:

1. Allahu Təala sevgisi,
2. Allahın dininin sevgsi,
3. Axirət sevgisi və
4. Dünyaya nifrət.”

***Allaha xidmət edənə dünya xidmət edər:***

* Bu cür deyərdi: “Rəvayət edilir ki, Allah dünyaya bu cür vəhy etdi: Kim mənə xidmət edərsə, sən də ona xidmət et. Kim sənə xidmət edərsə, sən də onu (özünə xidmətdə) istifadə et.”

***Ən zərərli alış-veriş:***

* Ondan soruşuldu: “İnsanlar içərisində ən zərərli alış-veriş edən kimdir?”

Dedi ki: “Qalıcı olanı (yəni axirəti) fani olana (yəni dünyaya) satan kimsədir.”

# Yeddinci fəsil: Ölümü, cəhənnəm atəşini xatırlamaq və nəfsi hesaba çəkmək haqqında dediyi sözlər

***Ölümü xatırlamaq:***

* Bu cür deyərdi: “Ölümün onun son mənzili və qiyamətin görüş yeri olduğunu, əl-Cabbarın önündə durmağın məşhəd yerinin olduğunu bilən kimsənin dünyada həsrətinin uzun çəkməsi və saleh əməllərə çox rəğbət etməsi gərəkir.”

* Bu cür deyərdi: “Ey Adəm övladı! Əməlin sənə aiddir, Rəbbin ilə hansı hal üzrə qarşılaşmaq istədiyinə bir bax!”

* Həsən bir gün cənazədə yaşlı bir adam gördü. Dəfn mərasimi bitdikdən sonra ona dedi:

“Ey şeyx! Rəbbinin adıyla səndən soruşuram: zənn edirsənmi, (indi) bu ölü dünyaya qaytarılmağı, sonra da saleh əməllərini artırıb, keçmiş günahları üçün Allahdan bağışlanma diləməyi arzulayır?” Şeyx dedi: “Allah eləsin! Əlbəttə ki!”
Həsən dedi: “Bəs nə üçün biz hamımız (ölüm gəlməmişdən qabaq) bu ölü kimi olmuruq?!”
Sonra isə Həsən bu sözləri deyərək ayrıldı və dedi: “Əgər qəlblərdə həyat olsaydı necə də vacib bir nəsihətdir? Lakin dəvət etdiyimiz kimsələrdə həyat yoxdur.”

* Bu cür deyərdi: “Yəqinən inandığımız bir halda qeyrisi üçün əməl etdiyimiz ölümdən başqa haqqında heç bir şəkkin olmadığı bir şeyin, (sonradan) yəqinin olmadığı bir şəkkə çevrildiyini görmədim.”

* Bu cür deyərdi: “Üç şey olmasaydı Adəm övladı başını əyməzdi:

1. Ölüm
2. Xəstəlik
3. Yoxsulluq.

Bundan sonra o, (yenə) yerində durmur.”

* Deyildi ki, Fərəzdaqın[60] zövcəsi Nəvvar vəfat edəndə onun cənazəsinə Bəsrənin öndə gedənləri ilə yanaşı Həsən də qatıldı. Fərəzdaq onunla bərabər yürüdü və dedi:

“Ey Əba Saîd! Bilirsənmi insanlar nə deyir?” O isə dedi:

“Nə deyirlər?” Dedi ki:

“Bu cənazəyə insanların ən xeyrlisi ilə ən şərlisi gəldi.” Həsən dedi:

“Bununla kimi qəsd edirlər?” Dedi ki:

“Allah sənə rəhm etsin, sənin insanların ən xeyrlisi, mənim isə ən şərlisi olduğumu düşünürlər.” Həsən dedi:

“Nə mən onların ən xeyirlisiyəm, nə də sən onların ən şərlisisən. Lakin sən bu günün bənzəri bir gün için nə hazırlamısan?” Dedi ki:

“Altmış ildən bəridir Lə iləhə illəllaha şəhadət etməyi hazırlamışam.”

Nəvvar dəfn ediləndə Fərəzdaq bu şeri oxudu:

“Əgər (Rəbbim) məni əfv etməzsə, qəbrin sonrası üçün qorxuram,

---

[60] O, Həmmam ibni Ğalib ibni Sâsâ ət-Təmimi (h.38/h.114 - m.641/m.732) Əməvilər dövləti zamanında yaşayan Bəsrəli məşhur ərəb şairlərindən biridir. Künyəsi Əbu Firas olub, üzünün iri və qaşqabaqlı olmasına görə yuvarlaq çörəyə bənzədilərək həmin mənaya gələn Fərəzdaq ləqəbi ilə tanınmşdır. Babası Sâsâ ibni Naciyə səhabə idi. Şerlə hələ uşaq vaxtlarından məşğul olmağa başlamışdı və atası onu Bəsrə şəhərinə apararaq Əli (Allah ondan razı olsun) ilə görüşdürmüş, onun qarşısında şer oxutmuşdu.

Fərəzdaq əsasən cahiliyyə üslubunda şerlər deyən və öz dövrünün üç ən böyük hicv şairlərindən biri idi. Uzun ömür sürməsinə baxmayaraq dinə bağlılığı zəif olan, içkiyə və əyləncəyə düşkün birisi olduğu deyilir. Hətta iffətli qadınlara dil uzadaraq onlara iftira atmaqla məşhur olmuşdur.

(Çünki) oranın öz alovları və darlıqları ilə qəbrdən daha şiddətli əzabı var.

Qiyamət günü (cəhənnəmin) mərhəmətsiz rəisi məni alıb götürdüyü zaman,

Fərəzdaqı cəhənnəmə sürüklədiyi zaman (onun halı necə olacaq?

Boynu qandallanmış cəhənnəm atəşinə doğru yürüyən,

Adəm oğlu necə də ziyan içərisindədir."

(Fərəzdaq şe'rini bitirdikdən sonra) Həsən səsi eşidilincəyə qədər ağladı və dedi:

"Həqiqətən şe'rin bəzisi hikmətdir ."[61] Sonra isə dedi:

"Allah sənə rəhm etsin, ey Əba Firas! Əgər doğru düşüncə sahibi isən, bundan sonrası üçün də bu gün etdiyin kimi et. Sən Adil və Cömərd olan (rəbbinə) tərəf gedəcəksən. Sanki artıq həmin an gəlmişdir."

Sonra ayrıldılar və (bir gün) Fərəzdaq öldü. O bir nəfərin yuxusunda görüldü və belə dedi:

"Həsən ilə birlikdə olduğum həmin gün səbəbi ilə mənə rəhm edildi."

* Bu cür deyərdi: "Adəm övladı üç şeyin arasındadır:

1. Başa gələn bəla,
2. Yox olan nemət və
3. Can alan ölüm."

* Demişdir: "Adəm övladı bəlaların, müsibətlərin və ölümlərin hədəfidir." Sonra isə sızlayaraq və ağlayaraq dedi: ***«Ey Rəbbimiz!***

---

[61] Bu perğəmbərin (səllalahu aleyhi və səlləm) sözüdür. Buxari "Ədəbul Müfrəd"-də Ubey ibni Kâbdan mərfu olaraq rəvayət etdiyi hədisdə Allah Rəsulu (sallallahu aleyhi və səlləm) demişdir: **"Şerin bəzisi hikmətdir."** (Ədəbul Müfrəd, 381/858)

***Bizə həm (bu) dünyada, həm də axirətdə gözəl nemətlər ver və bizi (cəhənnəm) odunun əzabından qoru!»* (Bəqərə, 201)**

* Həsənin xidmətçisi Humeyd dedi: “Həsənin xəstələndiyi günlərin birində onu ziyarət edərək yanına girdik. Bizə bu cür dedi:

“Mərhaba, xoş gəldiniz! Allah sizə səlamətlə uzun ömür versin, bizi və sizi daimi məskən yurduna (cənnətə) yerləşdirsin.”

Dedik ki: “Allah sənə rəhm etsin bizə nəsihət et! Biz səndən eşitdiyimizlə faydalanmağı umuruq.”

Dedi ki: “Əgər sadiq olsanız, səbr edib, Allahdan qorxsanız, açığa çıxartdığınız bu hal gözəl bir şeydir. Qardaşlarım! Xeyirdən alacağınız nəsibiniz bir qulağınızın eşidib, o biri qulağınızın çıxartdığı bir şey olmasın. Muhamməddi (sallallahu aleyhi və salləm) görən kimsə onun gedib-gəldiyi hər bir halını görərdi. Onun nə kərpic üstə kərpic qoyduğunu, nə də qamış üstünə qamış qoyduğunu görmədi.[62] Ancaq onun (sallallahu aleyhi və salləm) üçün qaldırılmış hidayət nişanəsi uğrunda çalışdı. Onun yoluna tabe olana və izindən gedənə afərin olsun! Tələsin, cəld olun! Sonra da qurtulun! Axı nəyə görə sevinirsiniz və heç üzülmürsünüz? Kəbənin Rəbbinə and olsun ki, siz və ölüm sanki birlikdə gəlmisiniz. Xoşbəxt olan kəs onun üçün hazırlıq görəndir.”

* Əbu Abdurrahman dedi: “Həsənin yanına girdik və o xəstə idi. Vəsiyyət yazması üçün yanına katib gətizdirdi. Sonra isə dedi:

‘Yaz: Bismilləhir-Rəhmanir-Rahim! Bundan sonra,

Allahı qulu və kələsinin oğlu Həsən Allahdan başqa ilah olmadığına, tək olduğuna və heç bir şərikinin olmadığına,

---

[62] Yəni özü üçün bər-bəzəkli, təmtəraqlı ev və ya saray tikdirmədi.

Muhammədin Onun qulu və elçisi olduğuna şahidlik edir. Yenə o şahidlik edir ki, Allah Onunla dili sadiq, qəlbi ixlaslı bir şəkildə qarşılaşan hər bir kəsi cənnətə daxil edəcək."'

Sonra isə dedi: "Muazın bunu dediyini və əhlinə vəsiyyət etdiyini eşitdim. Sonra Muaz dedi: "Rəsulullahın (sallallahu aleyhi və səlləm) bunu dediyini və əhlinə vəsiyyət etdiyini eşitdim."

* Deyilənə görə Həsən ölüm yatağında ikən həddindən artıq çox təlaşlanır. Oğlu ona deyir: "Ey atacığım! Bu təlaşınla bizi qorxudursan." O isə deyir: "Ey oğlum! Artıq haqq gəldi və batil yox oldu. Budur, (artıq) mənim başıma daha öncə bənzəri gəlməyən bir şey gəlmişdir."

* Saleh əl-Muri demişdir: "Bir gün Həsənin yanına girdim və onun bu cür oxuduğunu eşitdim:

'Ölərək rahatlayan kimsə ölü deyildir,
Ölü yalnız diri halda ölü olandır.
Ölü yalnız kədərli və pis halda olan,
Ümidinin az olduğu halda gördüyün kimsədir."

***Cəhənnəm atəşini xatırlamaq:***

* Bu cür deyərdi: "Ömər ibnul Xattabdan (Allah ondan razı olsun) bu cür dediyi rəvayət edilmişdir:

"Cəhənnəm atəşini çox xatırlayın. Həqiqətən də onun istisi çox şiddətlidir, dibi çox dərindədir və toppuzları dəmirdəndir."

* Bu cür deyərdi: "Rəvayət edildiyinə görə Ömər ibnul Xattab (Allah ondan razı olsun) atəş yandırardı və əlini ona yaxınlaşdıraraq deyərdi:

"Ey Xattabın oğlu! Atəşə qarşı səbrinin necə olduğuna bir bax! Bəs

Cabbar olanın qəzəbinə qarşı sənin gücün necədir?' Sonra isə atəşdən və atəş əhlinin əməlindən Allaha sığınardı.”

Sonra Həsən deyərdi: “Əgər bu Ömərin (Allah ondan razı olsun) qorxusudursa, - hansı ki, onun cənnətlik olduğuna şahidlik edilmişdir,- bəs ey insanlar, siz necə əminlikdə ola bilərsiz?!”

***Nəfsi hesaba çəkmək :***

* Bu cür deyərdi: “Kim özünün hansı halda olduğunu bilmək istəyir? Elə isə o, (tərəzisinin) zərərli tərəfinin ağır tərəfindən fərqlənərək ona aydın olması üçün əməlini Qurana ərz etsin.”

* Bu cür deyərdi: “Öz nəfsini Allahın Kitabına ərz edən qula Allah mərhəmət etsin! Əgər işinə uyğun olarsa Allaha həmd edər və onun artmasını (Allahdan) istəyər. Əgər müxalif olarsa, onu razı salmağa çalışar və ən yaxın zamanda ondan (yəni işindən) geri dönər.”

* Bu cür deyərdi: “Adəm övladı necə də qəribədir! İki nəzarətçisi (yəni mələk) başının üstündədir, dili onların qələmi, tüpürcəyi isə onlarn mürəkkəbidir. Belə bir vəziyyətdə o, hələ də onu əlaqələndirməyən sözləri danışır."

* Bu cür deyərdi: “Ey Adəm övladı! Yaxşı əməllərinin danışılmasını sevirsən, pis əməllərinin danışılmasını isə xoşlamırsan. Sən (özün üçün) yəqini əsas aldığın bir halda, başqasını zənlə qınayırsan. (Bunları) əməlinə və sözünə nəzarət edən iki mələyin vəzifələndirildiyini bilməyinlə yanaşı edirsən.

Ey Adəm övladı! Ağıl sahibini nə gecənin işi onu gündüzün işindən əngəlləməz, nə də gündüzün işi onu gecənin işindən əngəlləməz. Artıq rəbbi ona rəhm edənə kimi qorxu onun qəlbindən ayrılmaz hala gəlmişdir.”

* Bu cür deyərdi: “Sənin nəfsinin sıx yüyənə[63] sərkeş heyvandan daha çox ehtiyacı var.”

* Həmçinin demişdir: “Bu qəlbləri təzələyin, çünki onlar tez paslanır. Bu nəfslərə çəki-düzən verin, çünki onlar sərkeşdilər. Əgər siz nəfslərinizi əngəlləməsəniz, onlar sizi son dərəcə şərli (istəklərə) meyl etdirərlər.”

---

[63] Yüyən: atın başına keçirilən kəm və cilovdan ibarət qoşqu ləvazimatıdır.

## Səkkizinci fəsil: Günahlar və bəzi çirkin işlərdən çəkinmək haqqında dediyi sözlər

***Günahlar haqında:***

* Bu cür deyərdi: “Ey Adəm övladı! Necə də zəif və çox qafil birisisən! İnsanları günahlara görə qınayırsan, özünü isə unudursan, qardaşının gözündəki tozu görürsən və öz gözlərinin önündə duran ağacın gövdəsini isə görə bilmirsən. Necə də insafın az və zülmün çoxdur.”

* Bu cür deyərdi: “Kim yeyiləcək bir məhsulu bahalaşması üçün qırx gün saxlayar, sonra isə onu üyüdər, bişirər və miskinlərə yedizdirərsə, bununla onun qəbahətindən qurtulmaz və günahından əminlikdə olmaz.”

* Yenə Həsən bu cür deyərdi: “Ey Adəm övladı! (Davamlı) günahlar işləyirsən və Allahdan (boş) arzuları təmənni edirsən?!”

* Bu cür deyərdi: “Kim qardaşını Allah azzə və cəlləyə tövbə etdiyi bir günahından dolayı ittiham edərsə, o həmin günahın eynisini işləməklə imtahan olunmadan ölməz.”

* Həsən bu cür deyərdi: “Ey insanlar! İşləri sonraya saxlamaqdan çəkinin. Mən bəzi salehlərin bu cür dediyini eşitdim: ‘Biz tövbə edincəyə qədər ölməyimizi istəmirik, sonra isə ölüncəyə qədər tövbə etmirik.’ ”

* Yenə demişdir: “(İşləri) sonraya saxlamaqdan və (boş-boş) ümidlər etməkdən çəkinin! Bu sizdən öncəkiləri həlak etmişdir. Əbu Hazimin bu cür dediyi mənə xəbər verildi:

‘Biz tövbə edənə kimi ölmək istəmirik və biz ölənə kimi də tövbə etmək istəmirik. Bizdən kim günahkar şəkildə tövbə etmədən Allah ilə qarşılaşsa, onu atəşə salacaqdır, orası necə də pis bir yerdir.’ ”

* Həsən bir adamın bu cür dediyini eşidir: “Allahım günahkarları həlak et!" Həsən deyir: "O zaman yollar boş buraxılır və işləri idarə edənlər azalır.”

* Bu cür deyərdi: “Peyğəmbər (sallallahu aleyhi və səlləmin) bu cür dediyi rəvayət edilir:

**“Fasiq təriflənəndə Allahu təala qəzəblənir.”**[64]

* Bu cür deyərdi: “Övladında xoşuna gəlməyən bir şey gördüyün zaman, Allaha tərəf dön və Ona tövbə et! Səndən istənilən şey yalnız budur.”[65]

* Bu cür deyərdi: “İnsanlar elmi göstərib, əməli zay etdikləri zaman, dilləri ilə bir-birlərini sevib, qəlbləri ilə bir-birlərinə nifrət etdikləri zaman və qohumluq əlaqələrini kəsdikləri zaman Allah (cəllə sənəuhu) onları lənətləyər və onların qulaqlarını kar, gözlərini isə kor edər.”

* Bu cür deyərdi: “Ey Adəm övladı! Haramları halal görürsən,

---

[64] Hədis zəifdir: Xatib əl-Bağdadi "Tarixul Bağdad, 7/298, 8/428", Beyhaqi "Şuabul İman"-da, İbnu Adiy "əl-Kamil"-də hədisi zəif isnadla rəvayət etmişlər.

[65] Yəni günahlarından ötrü Allahdan bağışlanma dilə. Sələf ailədə və yaşayışlarında xoşa gəlməz (məsələn, itaətsizlik kimi) bir şeylə qarşılaşdıqları zaman bunun günahlarından dolayı olduğunu düşünərlərdi. Dərhal Allaha tövbə edib, Ondan bağışlanma diləyərlərdi.

cinayətlər törədirsən, böyük günahları işləyirsən, (buna baxmayaraq) Allahdan (bəzi) diləkləri arzu edirsən! (Ey günahkar insan!) Yalnız sağlam qəlblə  Allahın hüzuruna gələnlərdən başqa heç kimə nə malın, nə də övladların fayda verməyəcəyi vaxt (bunu) biləcəksən."

* Bu cür deyərdi: "Ömər ibnul Xəttabın (Allah ondan razı olsun) bu cür dediyi rəvayət edilmişdir:

'Qul yalan danışdığı zaman ondan gələn pis qoxu səbəbi ilə mələk bir millik[66] məsafə ondan uzaqlaşar.' "

* Həsən deyərdi: "Yalan danışan günah edər, günah edən isə (daha sonra) küfr edər. Küfr edən isə cəhənnəm atəşinə girər."[67]

* Bu cür deyərdi: "Dünya həyatında ikən nəfsini günahların xəstəliyindən tədavi etdirməyənə, artıq öldükdən sonra axirət yurdunda şəfa ondan uzaqdır, bədbəxtlik isə ona yaxındır."

* Bu cür deyərdi: "Qulun günahı ilə maraqlanması onu tərk etməyə səbəbdir. Ondan peşman olması isə tövbəyə səbəbdir. Qul günahı ilə o qədər maraqlanmağa davam edər ki, hətta bu onun üçün bəzi yaxşı əməllərindən daha faydalı olar."

---

[66] Mil uzunluq ölçü vahidi olub təqribən 1 km 609 metrə bərabərdir.

[67] Sələf "Günahlar küfrün xəbərçisidir" demişdir. Bunu günahlar üzərində israr edən və onu davamlı şəkildə işləyənin sahibini küfrə salacağından qorxduğu üçün demişlər. Çünki işlənən hər bir günah qəlbə qara nöqtə salır, sahibi ondan tövbə etməzsə, davam edib günahı israrla işlərsə, həmin nöqtənin çoxalıb qəlbi tamami ilə qaraldacağından və günah sahibinin sonda həmin əməlin halal görməsinə və ya Allahın dinindən hər hansı bir əmri inkar etməsinə səbəb olacağından qorxulur. Allah pak və müqəddəs olan Kitabında bir çox yerlərdə demişdir:

***«Allah günahkar toplumuna hidayət verməz.»*** **(Maidə, 108)**

Həmçinin Allah yalnız fasiqlər toplumunu azdıracağını da bildirmişdir:

***«(Allah) bununla bir çoxlarını azdırar və bir çoxlarına da hidayət verər. O,  bununla yalnız fasiqləri azdırar.»*** **(Bəqərə, 26)**

***Göstəriş üçün əməl etməyin və riyakarlığı qınanması haqqında:***

* Həsən bu cür deyərdi: “Riyakar adam onun haqqındakı Allahın qədərinə üstün gəlməyə çalışır. O, Allah qatında nifrət edilən fasiq birisidir və Allah bunu mömin qullarına bildirmişdir. O, isə insanların bu cür deməsini istəyir: 'Bu saleh birisidir.' Lakin onun riyakarlığı barəsindəki Allahın elmi qullarının nəfslərində yerləşdiyi halda, bu onun üçün haradan olacaq ki?”

* Yenə bu cür deyərdi: “Ey Adəm övladı! Haqqdan heç bir şeyi riya olaraq etmə və onu həya edərək də tərk etmə.”

* Bu cür deyərdi: “Rəca ibni Həyva[68] bir adamın sübhdən sonra özünü yuxuluğa vurduğunu gördü və ona dedi:

‘Allah səni əfv etsin! Diqqət et ki, kimsə bunun gecəni oyaq qalmaq və namaz qılmaq səbəbi ilə olduğunu zənn etməsin. Yoxsa əməlin puç olar.’ ”

* Deyildi ki, Həsən Farqad əs-Sabaxinin[69] üzərində yundan qiyafət gördü və ona dedi: “Ey Fərqad! Deyəsən sən bu qiyafətinlə insanlardan üstün olduğunu hesab edirsən? Mənə çatan xəbərə görə

---

[68] O, Reca ibni Həyva ibni Cərvalə (İbnu Cənzəl və İbnu Cəndəl də deyilir) əbu Mənsur əl-Kindiyyu əl-Əzdiyyu əl-Filistinidir. Tabiinlərin böyüklərindən olub, bir çox səhabələrdən hədis rəvayət etmişdir. Hicrətin 112-ci ilində vəfat etmişdir.

[69] O, Farqad ibnu Yâqub əs-Sabaxi əbu Yâqub əl-Bəsridir. Əslən erməni olub, tabiînin kiçiklərindən idi. Öncə əhli kitabdan idi, sonra İslamı qəbul etdi və zühd, ibadət ilə tanındı. Tövrat daxil olmaqla əhli kitabın bir çox kitablarından geniş bilgiyə sahib idi. Səîd ibnu Cübeyr, İbrahim ən-Nəxaî və s. kimi tabiînlərin böyüklərindən hədis dinləmişdir. Hicrətin 131-ci ilində Bəsrədə vəfat etmişdir.

cəhənnəm əhlinin libasının çoxu qiyafətlərdir.”

* Həsən demişdir: “Mənə anlatılan bir rəvayətə görə bir nəfər bu ayəni oxuyurdu: ***«İman edib saleh əməllər işləyənlər üçün Rəhman (könüllərdə) bir sevgi yaradacaq.»*** **(Məryəm, 96)** Yanından keçən bir nəfər bunu eşitdi və dedi: 'Vallahi! Allaha elə bir şəkildə ibadət edəcəm ki, məni dünyada (hər kəs) onunla anacaqlar.' Bundan sonra həmin adam namazdan heç ayrılmadı və oruc tutmaqla məşğul oldu. Hətta iftar etməzdi, namaz qılmaq və zikr etməkdən başqa bir halda görülməzdi. Lakin nə vaxt insanların yanından keçsəydi bu cür deyərdilər: 'Hələ də riyakarlıq edir, necə də çox riyakar birisidi.' Bunu görən həmin adam öz nəfsinə bunları dedi: "Anan səni itirsin[70]! Sənin ancaq şər ilə anıldığını görürəm. Dininin və etiqadının ifsad olunmuş vəziyyətdən başqa bir halda səni görmürəm. Çünki sən əməlinlə Allahın rizasını istəmirsən.' Sonra isə o, etdiyi əməllərin üzərində qalır və onlara heç bir şey əlavə etmir. Yalnız niyyətini düzəldir və bununla da insanların onun haqqındakı fikirləri dəyişir. Artıq kimin yanından keçsəydi onun haqqında bu cür deyərdilər: ‘Allah buna mərhəmət etsin! Artıq indi, bəli, islah oldu.’ ”

* Həsən bu cür deyərdi: “Əməllərinizi sırf Allah üçün edin! Rəsulullahın (sallallahu aleyhi vəsəlləm) bu cür dediyi rəvayət edilmişdir:

**“Kim, insanlar onu görəndə namazını gözəlləşdirər, görmədiklərində isə onu pis edərsə, bu Rəbbinə qarşı hörmətsizlik olub onu təhqir etməkdir.”[71]**

Yenə (sallallahu aleyhi və səlləm) deyərdi:

---

[70] Ərəblərdə bu kimi ifadələr qınama məqsədi ilə işlədilir.

[71] "Mucməûz-Zəvaid, (10/221)" – hədis zəifdir.

**“Kim, əməlini insanlara eşitdirərsə, Allah da onun (gizli) işlərini qiyamət günü qullarından eşidənlərə eşitdirər və onu həqir, zəlil edər.”[72]**

* Həsənin bu cür dediyi söyləndi: “Rəvayət edilmişdir ki, Allah subhanəhu təala kimin əməllərindən bir yaxşı əməli qəbul edərsə, onunla həmin adamı cənnətə daxil edər.” Deyildi ki:

“Ey Əba Saîd! Bəs qulların (digər) yaxşı əməlləri hara gedəcək?”

Dedi ki: “Allah azzə və cəllə yalnız xalis, təmiz olan, riya və kibirdən uzaq olan əməli qəbul edər. Kimin bir yaxşı əməli bunlardan qurtularsa, o, nicat tapan kimsələrdən olar.”

* Bu cür deyərdi: “Bəzi saleh kimsələrdən bu cür dedikləri rəvayət edilmişdir: Zühdün ən fəzilətlisi zühdü gizlətməkdir.”

* Bu cür deyərdi: “Ey Adəm övladı! Heç utanmırsanmı? Abidlər kimi danışır, zalimlər kimi zorbalıq edirsən.”

* Bu cür deyərdi: “Rəvayət edilir ki, Səîd ibni Cübeyr ibadət etməkdən özünü öləcək kimi göstərən bir adam gördü və ona dedi:

‘Ey qardaşımın oğlu! Şübhəsiz ki, İslam diridir, sən də onu dirilt. Onu öldürmə, yoxsa Allah səni öldürər və diriltməz.’ ”

* Həsən rəvayət edərdi ki, bir gün Aişə anamız (radiyallahu anha) özünü sanki öləcək kimi göstərən bir adamı gördü və soruşdu: “Buna nə olub?” Dedilər ki: o saleh adamdır. O isə dedi: “Ömər (radyallahu anhu) ondan daha saleh birisi idi, gəzdiyi zaman sürətli yürüyərdi, vurduğu zaman (zərbəsi) ağridardı və yedirdiyində doyurardı. Saxtakarlığı buraxın! Şühəsiz ki, Allah saxta əməl işləyənlərin heç bir əməlini qəbul etməz.”

---

[72] Hədisin əsli "Səhihu-Buxari, Kitabu-Riqaq: (6399)"-dədir

***Qeybət haqqında***

*Həsənə bir nəfərin onun qeybətini etdiyi xəbəri çatdı. Ona xurma dolusu qab göndərdi və dedi:

“Qeybətimi etməyinlə öz yaxşılıqlarını (yəni savablarını) mənə hədiyyə etdin və səni buna görə mükfatlandırdım.”

Adam utandı və bir daha onun haqqında pis danışmadı.

* Bu cür deyərdi: “Töhmət yollarına girən kimsə üçün, haqqında edilən qeybətdən dolayı bir əcir olmaz.”[73]

* Bu cür deyərdi: “Üç şeydə qeybət olmaz:

1. Günahını açıqdan işləyən fasiqin günahı barədə danışmaq,
2. Bidət sahibinin bidəti barədə danışmaq və
3. Zalim imamın zülmündən danışmaq.”

***Həsəd haqqında:***

* Yunus ibni Həbib dedi: “Həsən əl-Bəsrinin (Allah ona rəhmət etsin) bu cür dediyini eşitdim:

‘İki şey heç vaxt bir arada ola bilməz: qane olmaq ilə həsəd. İki şey isə bir-birindən heç vaxt ayrılmaz: aşırı istək və həsəd.’ ”

* Bir nəfər ondan soruşdu: “Mömin həsəd edərmi?”

Dedi ki: “Atasız qalasan![74] Yusufun (aleyhissəlam) qardaşlarını və həsədin onlara nələr etdiyini sənə kim unutdurdu?”

---

[73] Çünki insanların onun qeybətini etmələrinə səbəb elə özü olmuşdur.

[74] Bu ifadə ərəblərdə qınama üslubu kimi işlədilir.

***Bidət və zəlalət əhli haqqında:***

* Bu cür deyərdi: “Üç şeydən çəkin və onlarda şeytanın sənin nəfsinə hakim olmasına imkan vermə:

1. Quranı öyrədirəm desən belə, qadınla xəlvətdə qalma.
2. Yaxşılığı əmr edib, pislikdən çəkindirirəm desən belə, sultanın yanına girmə.
3. Bidət sahibi ilə birlikdə oturma, çünki o qəlbini xəstə edir və dinini ifsad edir.”

* Bu cür deyərdi: “Kim bidət sahibinə hörmət göstərərsə, bununla İslamı yox etməyə təşəbbüs etmiş olar.”

* Soruşuldu ki: “Ey Əba Saîd! Qiyamət günü insanların ən çox fəryad edəni kimdir?”

Dedi ki: "İnsanların tabe olduğu zəlalət yolunu ortaya çıxaran adam, xidmətçisi ilə pis rəftar edən adam, nemət bəxş olunan, lakin onu Allaha (azzə və cəlləyə) üsyanda istifadə edən adam."

***Fitnə və bəzi şeylərdən çəkinmək haqqında:***

* Bir adam ondan soruşdu: “Fitnə nədir və onu ortaya çıxaran şey nədir?”

Dedi ki: “Vallahi o, Allah azzə və cəllənin cəzasıdır. Qulları Ona üsyan etdikləri zaman və Ona olan itaəti gecikdirdikləri zaman Allah onu qullarına yerləşdirər.”

* Bu cür deyərdi: “Cahil abiddən və fasiq alimdən çəkinin. Şübhəsiz ki, o ikisində fitnəyə məruz qala bilən hər kəs üçün bir fitnə var.”

* Bu cür deyərdi: “Bəzi işlərdən uzaq durun. Adamın biri yemək yeyər, bir yerə daxil olar, bir məclisdə qəlbi başqa bir halda oturar və özü də hiss etmədiyi bir halda dini əldən gedər.”

* Həsən bu cür deyərdi: “Bəlanın məşəqqəti dörd şeydir: ailə (fərdlərinin) çoxluğu, malın azlığı, məskunlaşılan yerdə pis qonşu və haqqsızlıq edən zövcə.”

* Bu cür demişdir: “Kim axir zamana yetişərsə. evində sərilən həsirlərdən bir həsir olsun.”[75]

***Təriflməkdən çəkinmək haqqında:***

* Bu cür deyərdi: “Təriflməkdən çəknin. Şübhəsiz ki, o baş kəsməkdir.”[76]

Rəvayətə görə, bir adam peyğəmbərin (sallallahu aleyhi və səlləm) hüzurunda tərifləndi. O, (sallallahu aleyhi və səlləm) isə dedi:

**“Siz onun belini qırdınız. Əgər o, bunu eşitsəydi, ondan sonra**

---

[75] Yəni evini tərk etməsin. Bu fitnələrin çoxaldığı zaman müsəlmanın öz evinə çəkilərək, ev əhli ilə məşğul olması və fitnələrdən uzaq durması barəsindədir.

[76] Peyğəmbər (sallallahu aleyhi və səlləm) demişdir:
"Bir-birinizi təriflməkdən çəkinin. Çünki bu,baş kəsməkdir." (Musnədu Əhməd, (4/92); Sunənu İbni Macə, (2407))
Həmçinin Buxari **"Ədəbul Müfrəd,** *153/(336)***"**-də Ömərin (Allah ondan razı olsun) bu sözünü rəvayət etmişdir:
"Təriflmək bir baş kəsməkdir" Muhamməd isə dedi: "Yəni əgər bunu qəbul edərsə (bu onun üçün bir ölümdür.)"
Buxarinin burda sözünü nəql etdiyi Muhamməd onun şeyxi Muhəmməd ibni Səllamdır.
Rəvayətlərdən anlaşılan budur ki, əgər bir kimsə başqasını təriflədiyi zaman, təriflənən şəxs həmin tərifi eşidib ondan razı qalsa, sanki tərif edən onun başını kəsməklə onu öldürmüş və həlak etmiş olur.

**heç** vaxt qurtulmazdı."[77]

* Bu cür deyərdi: "Kim camaat içərisində öz nəfsini pisləyərsə, bununla (əslində) onu tərifləmiş olar. Onun etdiyi necə də pis bir şeydir."

***Dilin insana təsiri haqqında:***

* Həsən bir nəfərin çox danışdığını eşitdi və dedi: "Ey qardaşımın oğlu! Dilini tut! Deyilib ki, dildən daha çox həbs edilməyi haqq edən bir şey yoxdur."

* Peyğəmbərin (səlallahu aleyhi və səlləm) bu cür dediyi rəvayət edildi:

**"Məgər insanları burunları üstə cəhənnəmə sürükləyən dilləri ilə qazandıqlarından başqa bir şeymidir ?!"[78]**

* Bu cür deyərdi: "Arifin dili qəlbinin arxasındadır. Danışmaq istədiyində düşünər, əgər söz onun lehinə olsa onu danışar, yox əgər əleyhinə olsa susar. Cahilin qəlbi isə dilinin arxasındadır, nə zaman ağlından bir söz keçirərsə, onu danışar."

* Bu cür deyərdi: "Kim Quranda xəta etsə, bunula Allaha qarşı yalan danışmışdır. Çünki Allah subhanəhu təala demişdir:

***«Nə önündən, nə də arxasından batil ona yol tapa bilməz.»*** **(Fussilət, 42)**

Xəta isə batilin ən böyüyündəndir."

---

[77] Həmçinin bax: "Səhihu-Buxari, *Kitabu Ədəb*: *(2663), (6060)*"; "Səhihu-Muslim, *Kitabu-Zühd: (3001)*" ; "Musnədu Əhməd, *(23312)*" ; "Tirmizi, *(2393)*"

[78] Tirmizi, (2617); İbni Macə, (3973); Əhməd, (5/231, 236, 237)

* Bir nəfər ona dedi: “Ey Əba Səîd, sənin dilin (heç) xəta etmir.” O isə dedi: “Ey qardaşımın oğlu! Mən artıq dil ilə xəta etməyi keçdim.”

# Doqquzuncu fəsil: Quran oxumaq və bəzi ayələr haqqında dediyi sözlər

* Həsən bu cür deyərdi: “Ömərdən (Allah ondan razı olsun) bu cür dediyi rəvayət edilir:

‘Ey insanlar! Quranı oxuyun! Onu oxumaqla insanlardan bir şey istəyən qövm ortaya çıxmazdan öncə siz onu oxuyun və bununla Allahın qatındakıları istəyin.’ ”

* Bu cür deyərdi: “Ey insanlar! Şübhəsiz ki, bu Quran möminlərə şəfa və müttəqilərə imamdır. Kim onu özünə rəhbər tutarsa, hidayət olunar, kim də ondan uzaqlaşarsa, bədbəxt olar və başına müsibətlər gələr.”

* Bu cür deyərdi: “Bir adam Quranı və Allah azzə və cəllənin elmini öyrənərsə, bu çox keçmədən onun xuşusunda, zühdündə, yumuşaq xassiyyətliliyində və təvazüsündə görülər.”

* Bu cür deyərdi: “Allahın Kitabı Quran ilə baş-başa qalıb öz nəfsini ona ərz edənə Allah mərhəmət etsin. Əgər nəfsi ona müvafiq olsa, Rəbbinə həmd edər və Ondan üzərinə olan lütfünü artırmasını istəyər. Əgər ona müxalif olsa, tövbə edər, Ona yönələr və dərhal günahından dönər.”

* Bu cür deyərdi: “İnsanların ən şərlilərindən olan elə camaatlar var ki, onlar Quranı oxuyarlar, (lakin) onun sünnəti ilə əməl etməzlər və onun yoluna tabe olmazlar. ***«Onlara həm Allah lənət edər, həm də lənətə edə bilənlər lənət edər.»*** **(Bəqərə, 159)**

Sizdən öncə elə bir insan yaşadı ki, o, Quran oxuyardı və ondan bir surəni gecə boyunca oxuyardı. Sabaha çıxdığı zaman bu onun

üzündən bilinərdi. Sizdən biri isə Quran oxuduğu zaman bu onun dilindən o tərəfə keçmir. Allah subhanəhu təala demişdir:

***«Biz (bu) mübarək Kitabı onun ayələrini düşünüb anlasınlar və ağıl sahibləri də ondan ibrət alsınlar deyə sənə nazil etdik.»*** **(Sad, 29)**

Amma vallahi, bu (oxumaq), onun hərflərini əzbərləyib, hüdudlarını zay etmək deyildir. Sizdən biri: Mən Quranı onun bir hərfini belə buraxmadan oxudum – desə yalan danışar. Allaha and olsun ki, (əslində) onun hamısını buraxmışdır. Vallahi, vallahi, onlar nə qurra, nə alim, nə də hikmət əhlidirlər. Qurra olan kimsə nə zaman bunun kimi bir söz deyər? Allah subhanəhu təala buyurur ki:

***«Həqiqətən Biz sənə ağır bir söz (Quranı) yükləyəcəyik (vəhy edəcəyik).»*** **(Muzzəmil, 5)**

Allah cəllə sənəuhu (burada) onunla əməl etməyi qəsd edir. Allah azzə və cəllə buyurmuşdur:

***«Biz onu oxutduğumuz zaman sən onun oxunmağını izlə»*** **(Qiyamə, 75)**

Yəni, halalını halal, haramını haram say. Allahın Rəsulu (sallallahu aleyhi və səlləm) vəfat edəndə, çox az nəfər müstəsna, onun səhabələri Quranın hifzini (hələ) tamamlamamışdılar. Bunu Quranı təzim edərək dəyərli saydıqlarına və öz nəfslərini onun təvilini (yəni təfsirini) hifz edib, möhkəm və mütəşabih ayələrinə əməl etməyə tabe tutduqlarına görə edərdilər."

* Həsən bu cür deyərdi: "Quranı oxuyanlar üç qrupdur:

1. Bir qrup Quranı onunla insanlardan bir şey istədikləri əşya halına gətirmişlər.
2. Digər qrup isə onun hərflərini mükəmməl öyrənib, onun

hüdudlarını isə zay edənlər,[79] onunla valilərin mallarını əldə etməyə çalışan və insanlarla təkəbbürlü davrananlardır. Qurana sahib olanlar arasında bu cins insanlar artıq çoxalmışdır, Allah onların saylarını artırmasın və onları məhv etsin!

3. Başqa bir qrup isə Quranı oxuyar, onun ayələri üzərində düşünər, onunla tədavi olunar, şəfası ilə şəfa istəyər və onu qəlblərindəki dərdin üzərinə qoyarlar. Məhz onlar ilə yağmur duasına çıxılar, onlardan dolayı nemətlər bəxş edilir və onların duası ilə bəlalar dəf edilir.[80] Onlar Allahın firqəsidirlər. Bilin ki, həqiqətən Allahın firqəsi,

---

[79] Yəni Quranın hərflərinin məxrəclərini mükəmməl bilən və təcvid qaydalarında usta olan, lakin Quranın əhkamlarına, halal və haramlarına riayət etməyənlər.

[80] Bu, dua ilə təvəssül etməyin caiz olan növlərindən biridir. Belə ki, əhli sünnət dua ilə təvəssül etməyin 3 şəkildə caiz olduğunu bildirmişlər:
1.Allah azzə və cəllənin isim və sifətləri ilə təvəssül etmək: ***«Ən gözəl adlar Allahındır. Ona bu adlar vasitəsi ilə dua edin.»*** **(Əraf, 180)**

2. İman və saleh əməllər ilə təvəssül etmək: ***«O kəslər ki: "Ey Rəbbimiz! Həqiqətən, biz iman etdik, bizim günahlarımızı bağışla və bizi cəhənnəm atəşinin əzabından qoru."- deyirlər.»*** **(Ali İmran, 16)**

3. Həyatda olan saleh insanların duası ilə təvəssül etmək: Bu, Allah qatında duasının qəbul olunacağı ümid edilən saleh bir kimsənin duası ilə Allaha təvəssül etməkdir. Səhabələr Allah Rəsulu (sallallahu aleyhi və səlləm) həyatda ikən onun yanına gələrlərdi və müxtəlif mövzularda dua etməsini istəyərlərdi. Ənəs ibnu Malik (Allah ondan razı olsun) anladır ki:

**“Bir dəfə cümə günü Rəsulullah (sallallahu alyhi və səlləm) minbər üzərində xütbə verərkən qapıdan bir adam içəri girdi və Rəsulullaha tərəf yönələrək dedi:**
**‘Ey Allahın Rəsulu! Heyvanlar həlak oldu, yollar kəsildi. Allaha dua et, bizə yağış yağdırsın.’**
**Rəsulullah (sallallahu aleyhi və səlləm) əllərini qaldırdı və dedi:**
**‘Allahım! Bizə yağış yağdır. Allahım! Bizə yağış yağdır. Allahım! Bizə yağış yağdır.’ ” Ənəs dedi ki:**
**“Vallahi həmin vaxt biz səmada heç bir bulud görməmişdik və o vaxt bizimlə Seli (dağı) arasında heç bir ev yox idi. Birdən peyğəmbərin arxası tərəfdan qalxan şəklində bir bulud yüksəldi, səmanın ortasına çatanda yağış yağmağa başladı.” Ənəs dedi ki: “Vallahi biz altı gün boyunca günəşi görmədik. Növbəti cümə günündə həmin adam yenə qapıdan içəri girərək Rəsulullaha tərəf yönəldi və dedi:**

məhz onlar qalib olanlardır."[81]

* Bu cür deyərdi: “Ey insanlar! Sizin Mushafa (yəni Qurana) nəzər salmağınız və içindəki Quranı oxumağınız gərəkir. Osmandan (Allah ondan razı olsun) bu cür dediyi rəvayət edilmişdir:

‘Mən içərisində Allah subhanəhunun əhdinə (yəni Mushafa) nəzər salmadığım bir günün keçməsini sevmirəm.’

Ondan Quran barəsində soruşulduqda, onun mübarək (yəni bərəkətli)

---

**‘Ey Allahın Rəsulu! Heyvanlar (yenə) həlak oldu, yollar (yenə) kəsildi. Allaha dua et yağışı kəssin.’**
**Rəsulullah (sallallahu aleyhi və səlləm) əllərini qaldırdı və dedi:**
**‘Allahım! Üzərimizə deyil, ətrafımıza; təpələrə, dağlara, meşələrə, dərələrə və ağaçların bittiyi yerlərə yağdır.’**
**Ənəs dedi ki: “Yağış kəsildi və biz çıxanda günəşin altında yürüdük.”** (Səhihu-Buxari, (967); Səhihu-Muslim, (8/897))

Peyğəmbərimizin (sallallahu aleyhi və səlləm) vəfatından sonra isə Ömər ibnul Xattab (Allah ondan razı olsun) yağışın kəsildiyi quraqlıq zamanında peyğəmbərimizin əmisi Abbasın (Allah ondan razı olsun) duası ilə Allahdan yağmur yağdırmasını istəmişlərdir. Ənəsin rəvayət etdiyi hədisdə Ömər bu cür dua etmişdir:

**“Allahım! Biz (daha öncə həyatda ikən) peyğəmbərimiz (sallallahu aleyhi və səlləm) ilə sənə təvəssül edirdik və Sən də bizə yağış yağdırardın. İndi isə peyğəmbərimizin əmisi ilə təvəssül edirik, bizə yağış yağdır." Ənəs dedi ki: "Bunun ardınca yağış yağmışdı.”** (Səhihu-Buxari, (3710))

Həsən əl-Bəsrinin qəsd etdiyi də məhz saleh olan insanlardır. Hansılar ki, onların duası ilə təvəssül edilə bilir, yağış yağdırılması üçün Allahdan yardım istənilir. Bu da həmin insanların fəzilətlərinin çox olmasındandır.

[81] Allahu Təala müqəddəs Kitabında buyurmuşdur: ***«Allaha və Axirət gününə iman edən elə bir camaat tapa bilməzsən ki, onlar Allaha və Rəsuluna düşmən olanlarla – öz ataları, oğulları, qardaşları, qohum-əqrabaları olsalar belə - onlarla dostluq etsinlər. Allah onların qəlblərinə iman salmış və onları Öz tərəfindən bir ruhla dəstəkləmişdir. (Allah) onları altından çaylar axan Cənnət bağlarına daxil edəcəkdir. Allah onlardan razıdır, onlar da Allahdan razıdılar. Onlar Allahın firqəsidilər. (Bilin ki,) həqiqətən də Allahın firqəsi, məhz nicat tapanlar onlardır.»*** **(Mucadilə, 22)**

olduğunu demişdir və Mushafdakı Quranı onunla təbərrük edərək[82] oxuyardı.

Hər zaman onun otağında Mushaf görülərdi və o, peyğəmbərin (sallallahu aleyhi və səlləm) səhabələri içərisində Allah azzə və cəllənin Kitabını ən çox əzbər bilənlərdən idi.”

* Bir dəfə Həsən bu ayəni oxudu : ***«Onlar gecənin az bir qismini yatardılar»*** **(əz-Zəriyət, 17)** və dedi:

“Onlar səhərə kimi namaz qılmağa davam edərdilər, sonra isə bağışlanma diləyərdilər.”

Ondan gecə namazı üçün yuxudan oyanmanın vaxtı barəsində soruşdular. O isə dedi:

“O, gecənin ilk vaxtından fəcrə kimidir.”

* Bir gün bu ayəni oxudu: ***«Rəhmanın qulları o kəslərdir ki, onlar yer üzündə təvazökarlıqla gəzər, cahillər onlara bir söz dedikdə: "Salam!"-deyərlər.»*** **(Furqan, 63)** Sonra isə dedi:

“Onlar cahillik etməyən müsəlmanlardır. Əgər onlara qarşı cahillik edilsə, yumuşaq xasiyyətli olub, tələskənlik etməzlər.”

* Bu ayəni oxudu: ***«Biz onların (günlərini) bir-bir sayırıq.»*** **(Məryəm, 84)** Sonra isə dedi:

“Saymanın sonu canın (bədəndən) çıxmasıdır, saymanın sonu sevdiklərindən və övladlardan ayrılmaqdır, saymanın sonu qəbrə girməkdir. Ey Allahın qulları! Saleh əməllərə tələsin!”

* Bu ayəni oxudu: ***"Gözəl söz Ona tərəf qalxar və saleh əməl onu yüksəldər."*** **(Fatir, 10)** Sonra isə dedi:

---

[82] Yəni onun qiraəti ilə bərəkətini umaraq oxuyardı.

“Şübhəsiz ki, qul gözəl bir söz dediyi zaman və saleh əməl işlədiyi zaman, Allahu təala onun sözünü əməli ilə yüksəldər. Əgər gözəl söz deyər və pis əməl işlərsə, Allah subhanəhu onun sözünü əməli ilə rədd edər.”

* Həsən bu ayəni oxuyardı: ***«Mömin olaraq yaxşı işlər görən kişi və qadınlara əlbəttə gözəl həyat bəxş edəcək və etdikləri ən yaxşı əməllərə görə onları mütləq mükafatlandıracağıq»*** **(Nəhl, 16)** – bunu oxuduğu zaman deyərdi:

“(Yəni) onu qəlbində ləzzətini tapacağı bir itaətlə ruziləndirəcəyik.”

Bu cür dediyi də rəvayət edilmişdir:

“Ona səbəbi ilə əzablandırmayacağımız bir ruzi bəxş edəcəyik.”

Sonra isə deyərdi: “Vallahi, Adəm övladının bütün həyatı acıdır. Yalnız cənnətdəki həyatı müstəsnadır.”

* ***«O (surun üflənməsi) təkcə qorxunc bir səsdir. (Həmin vaxt) onlar dərhal (qəbrlərindən) yerin üzünə çıxacaqlar.»***

**(Naziat, 13-14)** –bu ayəni oxudu və dedi:

“Ey insanlar! Qorxunc səs qəzəbdən dolaydır. Kim Allahdan qorxursa, Onun qəzəbindən çəkinsin.”

* Ondan Allah azzə və cəllənin bu ayəsi barədə soruşuldu:

***«Kim (Allahın hüzuruna) yaxşı bir əməllə gələrsə, ona həmin əməlin on qat misli (qədər savab) verilər»*** **(Ənam, 160)**

O, isə dedi: “Kim Allahdan başqa heç bir ilah olmadığına, Onun tək olub, heç bir şərikinin olmadığına və Muhəmmədin (sallallahu aleyhi və səlləm) Onun qulu və elçisi olduğuna qəlbindən ixlaslı bir şəkildə (şahidlik etməklə) Allahın hüzuruna gələrsə, onun üçün Allah azzə və cəllənin yanında cənnət vardır.”

* Bir dəfə Həsən: ***«Yaxşılığın yaxşılıqdan başqa bir mükafatı varmı?»*** **(Rahmən, 60)** – ayəsini oxudu, sonra dedi:

“Allahdan başqa ilah yoxdur deyənin mükafatı cənnətə daxil olmasıdır.”

* ***«Xeyr! Onların qəlblərini qazandıqları (günahlar) bürümüşdür.»*** **(Mutaffifin, 83)** – ayəsini oxudu və dedi:

“O, qəlb ölənə və qaralana kimi günah üzərinə günah işləməkdir.”

* Yenə demişdir: “Ey insanlar! Şübhəsiz ki, Allah azzə və cəllə sizin üçün səhifə açmış və biri sağ tərəfdə, digəri isə sol tərəfdə olan iki şərəfli mələyi sizdən hər biriniz üçün vəkil təyin etmişdir. Allahu təala o ikisinin üzərində nəzarətçidir. İstərsə azaldar, istərsə çoxaldar. O, yalnız kitabı yazır.

***«O, nə bir kiçik, nə də bir böyük günahı buraxmadan hamısını sayıb yazmışdır! Onlar etdikləri əməlləri öz qarşılarında görəcəklər. Rəbbin heç kəsə zülm etməz!»*** **(Kəhf, 49)**

* ***«Pislik edən kəs, onun cəzasını alacaq və o, Allahdan başqa özünə nə bir dost, nə də bir köməkçi tapmayacaqdır» (Nisa, 123)*** **–** Həsən bu ayə barəsində demişdir:

“Rəvayət edildiyinə görə bu ayə Rəsulullaha (sallallahu aleyhi və səlləm) nazil olanda Əbu Bəkr əs-Siddiq (Allah ondan razı olsun) demişdir:

‘Vallahi, belləri qıran ayə nazil oldu!’

Əgər bu Əbu Bəkrin sözüdürsə, - hansı ki, onun cənnətliyinə şahid olundu,- bəs ondan başqasının sözü necə olmalıdır? Ey möminlər toplumu ibrət alın və hazırlıqlı olun ki, bəlkə böyük günün əzabından əminlikdə olarsız.”

# Onuncu fəsil: Əmirlər və hakimlər haqqında dediyi sözlər

* Həsənin bu cür dediyi rəvayət edilmişdir: “Allah subhanəhu təala xəlifələrdən, əmirlərdən və hakimlərdən üç şey barəsində söz almışdır ki, kim Allahın əhdinə vəfa göstərsə qurtular, kim də yerinə yetirməzsə həlak olar. Bunlar,

1. Nəfsi istəklərə tabe olmamaları,
2. İnsanlardan qorxmayıb Allahdan qorxmaları və
3. Onun ayələrini ucuz qiymətə satmamaları.”

* Bu cür deyərdi: “Allah bir topluma şər diləmək istədiyi zaman, onların əmirlərini səfehlərindən edər, qənimətlərini xəsislərinin əlinə verər.”

* Bu cür deyərdi: “Bəzi səhabələrin (Allah onlardan razı olsun) bu cür dediyi mənə xəbər verildi:

‘Şübhəsiz ki, yer üzündə günahkar əmirlərin, yalançı vəzirlərin, xain əmanətçilərin, fasiq alimlərin və zalim rəhbərlərin olması qiyamətin əlamətlərindəndir.’ - Mən bunun içərisində yaşadığımız zamanın olmasından qorxuram.”

* Deyilir ki, bir gün Həsən Həccacın tərəfdarlarından bir adamın Əli (Allah ondan razı olsun) haqqında pis danışdığını eşitdi və dedi:
“Artıq onu haqq etdi.” Adam soruşdu:
“Ey Əba Saîd! Cəhənnəm atəşinimi?” Dedi ki:
“Bəli! Necə də pis yerdir.” Adam dedi:
“Allah əcrini versin! Bəs bunun üçün tövbə varmı?” Həsən bu cür cavab verdi:

“Ay, Anan səni itirsin! Məgər sən Allahın əzabından tövbə etməsən bir gücün olarmı?! Həqiqətən Allah tövbəkarları və təmizlənənləri sevir.”

* Bir gün Həsənin xidmətçisi Humeyd ona deyir:

“Ey Əba Saîd! Allah səni doğrultsun! İnsanların içində olduğu qarmaqarışıqlığı görmürsənmi?” O isə dedi:

“Ey Əba-l-Xayr! Dörd nəfər insanların işlərini düzəltmişdir:

1. Ömər ibnul Xattab (Allah ondan razı olsun) əs-Səqifə günündə[83] etdiyi işdir. Həmin vaxt ənsar: ‘Bizdən bir əmir, sizdən də bir əmir olsun.’ –dediyi zaman o, demişdir:

‘Bilmirsinizmi ki, Allahın Rəsulu (sallallahu aleyhi və səlləm): **“İmamlar Qureyşdəndir.”** –demişdir?’ Onlar da demişdilər:

‘Bəli, bilirik!’ Ömər isə demişdir:

‘Bəs bilmirsinizmi ki, peyğəmbər (sallallahu aleyhi və səlləm) Əbu Bəkri namazda imam olaraq önə keçirmişdir?’ Onlar da demişdilər:

‘Bəli, bilirik!’ Ömər yenə demişdir:

‘Elə isə hansınız Əbu Bəkrin önünə keçə bilər?’

‘Heç kim onu keçə bilməz.’ – deyərək ənsar bununla Ömərin dediklərini qəbul etmişdilər. Əgər Ömər bunu etməsəydi qiyamətə kimi insanlar xilafət mövzusunda çəkişəcəklərdi və hər bir tayfa bunda haqqın özünə aid olduğunu iddia edəcəkdir.

[83] əs-Səqifə Mədinə əl-Xazrəc qəbiləsindən olan Bəni Səidənin məskunlaşdığı yerin adıdır. Allahın Rəsulu (sallallahu aleyhi və səlləm) vəfat edəndə ənsardan olan səhabələr həmin yerdə toplanaraq müsəlmanların xəlifəsinin kim olması məsələsində müzakirə edirdilər. Ənsar xəlifənin özlərindən olacağını, mühacirlər isə onlardan olması gərəkdiyini iddia edərək ixtilafa düşmüşdülər. Ömərin Əbu Bəkrə beyət etməsinin ardınca hamı bundan razı qalaraq ona beyət etmişdilər.

2. Sonra isə Əbu Bəkrin (Allah ondan razı olsun) etdiyi işdir. Belə ki, o, mürtədlərin işi barəsində insanlara fikrini bildirdiyində onların hamısı ona nəsihət etdilər ki, (zəkatı verməyənlərin) namazı qılmaq mövzusunda göstərdikləri itaətlərini onlardan qəbul etsin, zəkatın tərki mövzusunda isə onları sərbəst buraxsın. O isə demişdir:

'Vallahi, əgər onlar Rəsulullaha (sallallahu aleyhi və səlləm) verdikləri dişi ovlağı mənə verməzlərsə onlarla savaşacam.'[84]

Əgər Əbu Bəkr (Allah ondan razı olsun) bunu etməsəydi insanlar qiyamət gününə kimi zəkatı tərk edəcəkdilər.

3. Sonra isə Osmanın (allah ondan razı olsun) insanları Mushaf mövzusunda bir araya gətirərək Quranı toplaması ilə bağlı gördüyü işdir. İnsanlar o vaxt Quranı fərqli hərflər üzərinə oxuyurdular. Hər bir qrup: 'bizim qiraətimiz sizinkidən daha üstndür.' – deyirdi və hətta az qala bir-birlərini təkfir edirdilər. Əgər Osman (Allah ondan razı olsun) bunu etməsəydi, insanlar qiyamət gününə kimi Quran mövzusunda (ixtilafa düşərək bəzi şeyləri) inkar edəcəkdilər.

4. Sonra isə Əlinin (Allah ondan razı olsun) Bəsrə əhalisi ilə savaşdığı vaxt gördüyü işdir. Savaş bitdikdə o, ələ keçirilən malları əsgərlərin arasında böldüyü vaxt onlar demişdilər:

'Ey möminlərin əmiri! Onların övladlarını və qadınlarını aramızda bölməyəcəksənmi?' O, isə onların bu tələbini inkar etmiş və demişdir:

'Sizdən kim öz payına möminlərin anasını almaq istər?' – bunu onlarının tələbini inkar edərək demişdir. Sonra yenə demişdir:

'Oğullarını və ərlərini itirməklə dul qalmış o, qadınları

[84] Bax: "Səhihu-Buxari, (7284), (7285)"; "Səhihu-Muslim, (20)"; "Tirmizi, (2607)"

görürsünüzmü? Onların iddətlərini gözləyib, onlara miras qalmış haqqlarından dörddə birini, üçdə birini və altıda birini verəcəkmisiniz?’ Onlar da:

‘Bəli.’ - deyərək cavab vermişdilər. Əli isə demişdir:

‘Əgər onlar sizin cariyələriniz olsaydı, nə onların miras haqqları olardı, nə də iddətləri olardı.’

Bununla əsgərlər Əlinin dediklərinin doğru olduğunu anladılar və onunla razılaşdılar. Əgər Əli (Allah ondan razı olsun) bu cür etməsəydi, insanlar qiblə əhli ilə aparılan savaşın (əkamlarının) necə olacağını bilməyəcəklərdir.”

* Rəvayət edilir ki, Ömər ibni Abdulaziz (rahiməhullah) Həsənə yazdı:

“Ey Əba Saîd! Mənə bir nəsihət yaz və onu qısa tut.” Həsən əl-Bəsri ona bu cür yazdı:

“Ey Möminlərin əmiri! Bil ki, əgər səbr sənə öz acılığını erkən daddırırsa, ardınca onun xoş şirinliyinin səni izləməsi necə də gözəldir?! Ey möminlərin əmiri! Bil ki, qazanan o kəsdir ki, iqamət yurdunda güvənliyə nail olmağa səy göstərər və (Allahın) rəhməti ilə cənnətə daxil edilər.”

* Yenə Ömər ibni Abdulazizin (rahiməhullah) Həsənə bu cür yazdığı rəvayət edilir:

“Ey Əba Saîd! Mənə dünyanın qınanması barədə yaz.” O isə bu cür yazdı:

“Ey möminlərin əmiri! Şübhəsiz ki, dünya ayrılmaq və köçmək yurdu olub, əsla (daimi) yaşayış yurdu deyildir. Adəm (aleyhissəlam) oraya yalnız cəza olaraq enmişdir, elə isə ondan çəkin. Onu istəyən onunla baş-başa buraxılır, onun zəngini (əslində) fəqirdir, dünya əhli

içərisində ən xoşbəxt olanı isə ona məruz qalmayanıdır. Çox ağıllı kimsə dünyanı sınadığı zaman, onu əziz tutanı zəlil etdiyini və onu toplayanı parçaladığını görər. Dünya bir zəhər kimidir, onu tanımayan yeyər, ondan cahil qalan ona rəğbət bəsləyər və Allaha and olsun ki, dünyada onun ölümü vardır.

Ey möminlərin əmiri! Dünyada yarasını tədavi edən kimsə kimi ol, o, sevmədiyi şeyin uzanması qorxusundan, zərər verən şeylərdən azacıq da olsa uzaq durar. Onun çətinliklərinə səbr etmək dərdlərinə qatlanmaqdan daha yüngüldür. Ağıl sahibi ondan çəkinər və onunla aldanmaz. O sədaqətsiz, çox aldadıcı, (cəhənnəm atəşi üçün) odun daşıyandır. O, haqqında ümidlərə məruz qalmış və onunla nişanlanmaq istəyənlər üçün bəzənmişdir. O sanki bir gəlindir, gözlər ona baxır və qəlblər ona valehdir. Muhəmmədi haqq ilə göndərənə and olsun ki, o ərlərini öldürən qadınlar (kimidir.)

Elə isə ey əmir! Onun çarpıntısından qorx və onun cilvəsindən ehtiyat et. Ondakı rahatlıq, şiddət və bəlaya bağlıdır, onda qalmaq isə həlaka və yox olmağa aparır.

Ey möminlərin əmiri! Dünyanın arzuları yalançı, ümidləri batil, saflığı bulanıq və yaşayışı çətinlikdir. Onu tərk edən müvəffəq olandır, ondan yapışan isə boğularaq həlak olandır. Ağıllı zəka sahibi olan Allahın qorxutduğu şeydən qorxan, çəkindirdiyi şeydən çəkinən və yox olan yurddan ayrılıb əbədi olan yurda gələndir. Beləcə ölüm anında yəqin ona gələr.

Ey möminlərin əmiri, vallahi dünya bir röyadır və o, cəza yurdudur. Yalnız ağlı olmayan onun üçün (mal) toplayar və bilgisi olmayan ona aldanar. Uzaq görən və ağıl sahibi dünyada yarasını tədavi edən kimsə kimidir. Belə ki, o, sağalmağı umduğuna görə və dünya məskəninin pis nəticəsindən qorxduğu üçün dərmanın acılığına səbr edər.

Ey möminlərin əmiri! Allaha and olsun ki, dünya bir yuxu, axirət isə oyanışdır. O ikisinin arasında isə ölüm dayanır və insanlar qarmaqarışıq yuxular içərisindədirlər. Ey möminlərin əmiri mən sənə hikmət sahibi birisinin dediyini deyirəm:

Əgər ondan qurtulsan, böyük çətinliklərdən qurtularsan,

Yoxsa mən sənin qurtulan birisi olduğunu zənn etmərəm."

Həsənin məktubu Ömər ibni Abdulazizə çatanda o, hönkürərək ağladı, hətta yanındakılar Həsənə rəhmət oxudular. O dedi:

"Allah Həsənə mərhəmət etsin! Hələ də bizi yuxudan ayıtlmağa davam edir və bizi qəflətdən oyadır. Allah üçün o, necə də nəsihət etdiyinə qarşı şəfqətlidir! Necə də ən doğru sözlü və ən fasih nəsihət edəndir!"

Ömər ibni Abdulaziz də ona bir məktub yazdı və dedi:

"Sənin faydalı nəsihətlərin (bizə) çatdı, onunla (bizə) şəfa oldun, dünyanı öz sifətləri ilə vəsf etdin. Dünya əhlindən aqil olan kimsə qorxu içərisindədir, sanki onun əhlindən üzərinə ölüm yazılanlar artıq ölmüşdür. Salam, Allahın rəhməti və bərəkəti üzərinə olsun!"

* Ömər ibni Âbduláziz Həsən əsl-Bəsriyə məktub yazdı:

"Ey Əba Saîd! Mənə adil imamım sifəti haqında yaz, o haradadır və onunla ümmətin arası necədir?"

Həsən ona bu cür yazdı:

"Allah səni nemət baxçalarında faydalandırsın və səni yaratdığı bağlarda gəzdirsin. Bil ki, Allah subhanəhu təala adil imamı hər əyilən kimsə üçün bir dirək, hər zalim üçün müraciət olunan, hər səhvi doğruldan, hər zəif üçün qüvvət, hər məzlum üçün ədalət və hər çarəsiz üçün bir sığıncaq yeri etmişdir. Adil imam şəfqətli çoban və əzimkar yoldaş kimidir. Hansı ki, o, qoyunları üçün ən gözəl

otlayacaq yerləri axtarır, onları həlak olmuş otlaqlardan qoruyur, yırtıcı heyvanlardan himayə edir, ona istinin və soyuğun əziyyəti kifayət edir.

Adil imam övladına qarşı şəfqətli olan ata kimidir; balaca olduqları zaman onlar üçün çalışan, böyüdükləri zaman onları öyrədən, həyatda olduğu zaman onlara qazanc verən, ölümündən sonrasında isə onlar üçün tədarük görəndir .

Adil imam yetimlərə baxan və miskinlərə xəzinədarlıq edən kimsə kimidir; onların kiçiklərini tərbiyə edir, böyüklərinin isə dolanışıqlarını təmin edir.

Adil imam bədən üzvləri arasında qəlb kimidir, onun doğruluğu ilə hamısı doğrular, pozulması ilə də hamısı pozular.

Adil imam Allah ilə Onun qulları arasında durur, o, Allahın kəlamını eşidir, sonra isə onlara eşitdirir, Rəbbinin nemətlərinin əsərlərini görür və onlara göstərir, Allahu təalanın əmirlərinə boyun əyir və onlara örnək olur.

Ey möminlərin əmiri! Sənin inşəallah adil imam olacağını ümid edirəm. Əgər Allah sənə nəsihət etməyi fərz etməsəydi, Allahın sənə hidayət bəxş etməsinə, səni müvəffəqiyət və doğruluqla ruziləndirməsinə görə sənə öyüd-nəsihət vermək ehtiyacında olmazdım. Lakin Allah azzə və cəllə insanlara haqqı açıqlamaları və onu gizləməmləri üzərinə alimlərdən əhd almışdır.”

# On birinci fəsil: Müxtəlif mövzularda etdiyi nəsihətlər və danışdığı hikmətlər

***Əsl xətib kimdir***

* Həsən (rahiməhullah) bu cür deyərdi: “Əsl xətib insanlara sözü ilə deyil əməli ilə xitab edəndir.”

***Allahın hiyləsindən arxayın olunma***

* Bu cür deyərdi: “Ey insanlar! Sizdən birinizin yoldaşı onu bir işdən çəkindirdiyində, ondan qorxar və çəkinər. Bəs Rəbbi çəkindirdiyində və cəzası ilə qorxutduğunda necə olur (ki, qorxub çəkinmirsiniz)? Allahu subhanəhu buyurur ki:

***«Onlar Allahın tələsindən arxayın idilərmi? Allahın tələsindən ziyana uğrayanlardan başqa heç kəs arxayın ola bilməz.»* (Əraf, 99)**”

***Boş və əbəs işlərlə məşğul olmaq***

* Bu cür deyərdi: “Cənnət ilə cəhənnəmin arasında yürüyən və gedəcəyi yerin hansı olduğunu bilməz bir halda olub, boş vaxt keçirən və qafil olan, zarafatlar edən və əylənən kimsəyə təəccüb etməzmisiniz? Rəsulullahdan (sallallahu aleyhi və səlləm) bu cür dediyi rəvayət edilmişdir:

‘Allahu təala sizin üçün namazda əbəs işlərlə məşğul olmağı, orucda pis sözləri danışmağı və qəbristanlıqda gülməyi çirkin gördü.’ ”

***Gündəlik əməl şahiddir***

* Bu cür deyərdi: “Adəm övladının üzərindən elə bir gün keçməz ki, ona bu cür deməmiş olsun:

‘Ey Adəm övladı! Mən yeni bir günəm və məndə nə əməl işləsən o (sənin üçün) şahiddir. Əgər səndən ötüb keçsəm, bir daha sənə geri qayıtmaram. Elə isə nəyi təqdim etsən, onu da qarşında görərsən və nəyi gecikdirsən, o heç vaxt sənə geri dönməz.’

***Allah qorxusundan dolayı axıdılan göz yaşı***

* Bu cür deyərdi: “Allah qorxusundan gözləri yaş ilə dolan elə bir kimsə olmaz ki, Allah onun cəsədini cəhənnəm atəşinə haram etməmiş olsun. Əgər göz yaşları onun yanaqlarına axarsa, həmin üzü nə toz-torpaq, nə də ki zillət bürüməz. Elə bir əməl yoxdur ki, onun mütləq (tərəzidə) çəkisi və savabı olmamış olsun, yalnız Allah qorxusundan axan göz yaşı müstəsnadır; o cəhənnəm atəşinin istisindən Allahın dilədiyini söndürür. Əgər bir adam ümmət üçün Allah qorxusundan ağlayarsa, Allahu təalanın onun ağlaması ilə bu ümmətin hamısına rəhm edəcəyini umuram.”

***Saleh əməllər işləmək***

* Bu cür deyərdi: “Ey Adəm övladı! Sənin sözün və əməlin var. Sən sözündən daha çox əməlinə layiqsən. Sənin gizli və açıq halların var. Sən açıq halından daha çox gizli halın ilə məsulsan. Sənin dünyalığın və aqibətin (yəni axirətin) var. Sənin aqibətin dünyalığından daha çox önəmlidir.

Ey Adəm övladı! Şübhəsiz ki, Allah subhnəhu təala bu cür buyurmuşdur: ***«Gözəl söz Ona tərəf qalxır və saleh əməl onu***

***yüksəldir.»* (Fatir, 10)** – Allah sizləri müvəffəq etsin! Saleh əməllər işləyin ki, onun nəticəsini əldə edəsiniz.”

* Bu cür deyərdi: “Ey Adəm övladı! İtaətlərdən heç bir şeyi həqir görmə, hətta sənin nəfsində az olsa da, yanında kiçik olsa da. Şühəsiz ki, Allah subhanəhu təala zərrə miqdarınca olan yaxşı əməlləri də qəbul edir və dərhal mükafatlandırır. Əgər sən Rəbbinin yanında onun dəyərini bilsəydin, bu səni mütləq sevindirərdi. Günahlardan heç bir şeyi həqir görmə, hətta sənin nəfsində az olsa da və yanında kiçik olsa da. Şübhəsiz ki, sənin Rəbbin şiddətli əzab verəndir.”

* Yenə bu cür deyərdi: “Ey insanlar! Səhhətin və boş vaxtın qiymətini bilin. Gözlərin bərələcəyi və qəlblərin dəhşətə düşəcəyi gün gəlmədən öncə saleh əməllər işləməyə tələsin.”

### *İnsanlarla münasibət*

* Bu cür deyərdi: “Ey adəm övladı! Səltənət sahibindən qorxma, çünki o sənin sahibinin (yəni Rəbbinin) köləsidir. Mal sahibinə tamah etmə, çünki o, sənin Rəbbinin bəxş etdiyi ruzidən yeyir. Günah sahibi ilə dostluq etmə, çünki o, sənin üçün pis aqibətdir. Yoxsulu həqir görmə, çünki o, Sənin doğma qardaşındır.”

### *Dinini qoru*

* Bu cür deyərdi: “Ey Adəm övladı! Sən təkbaşına öləcəksən, təkbaşına diriləcəksən və təkbaşına hesaba çəkiləcəksən.

Ey Adəm övlladı! Əgər bütün insanlar Allaha itaət etsələr və sən Ona üsyan etsən, onların itaətlərinin sənə faydası olmaz. Əgər onlar Allaha üsyan etsə və sən Ona itaət etsən, onların günahları sənə zərər

verməz.

Ey Adəm övladı! Dinini qoru, dinini qoru! O yalnız sənin ətin və qanındır. Əgər dinin salamat olsa, ətin və qanın da salamat olar. Əgər bundan başqa bir şey olarsa, ondan Allaha sığın; o isə yalnız sönməyən atəş, çürüməyən cəsəd və ölməyən nəfsdir."

***Allah üçün əməl edin, ruzinizi Allah bəxş edir***

* Bu cür deyərdi: "Rəvayət edildiyinə görə İsa (aleyhissəlam) həvarilərinə demişdir:

'Allah üçün əməl edin, qarınlarınız üçün əməl etməyin. Şübhəsiz ki, quş nə əkər, nə də biçər, heç bir ruzisi olmadığı halda səhər yuvasından çıxar, Allah ona ruzi bəxş edər. Əgər desəniz ki, bizim qarnımız onunkundan daha böyükdür, baxın vəhşi heyvanlar da nə əkərlər, nə də biçərlər. Ruziləri olmadığı bir halda çıxarlar, Allah onlara da ruzi bəxş edir.' "

***İnsanların ən xeyirlisi ilə ən şərlisi***

* Həsən dedi: "Ömər ibnul Xattabın bu cür dediyi rəvayət edildi:

'Sizə insanların ən xeyirlisinin kim olduğunu xəbər verimmi?' Dedilər ki: 'Bəli, ey möminlərin əmiri!' Dedi:

'Ömrü uzun olan, əməli gözəl olan, xeyri ümid edilən və şərrindən qorxulmayan kimsədir.' Sonra isə dedi:

'Sizə insanların ən şərlisinin kim olduğunu xəbər verimmi?' Dedilər ki: 'Bəli, ey möminlərin əmiri!' Dedi:

'Ömrü uzun olan, əməli pis olan, xeyri ümid edilməyən və şərrindən əminlikdə olunmayan kimsədir.' "

***Şəfaət haqqında***

* Ondan soruşuldu: “Ey Əba Saîd! Şəfaət[85] haqqında nə deyirsən? O gerçəkdirmi?” Dedi ki:

“Bəli” Soruşuldu ki:

***«Allah subhanəhu təala buyurur ki: «Oradan çıxmaq istərlər, lakin onlar oradan çıxan deyillər.»*** **(Maidə, 37)**

Həsən dedi: “O (iş) Allah subhanəhu təalanın dediyi kimidir.”

Soruşuldu ki: “Bəs ora girən nəyə görə girər və nəyə görə ordan çıxar?” Dedi ki:

“Onlar dünyada günahlar işləyərdilər, Allah da buna görə onları yaxalayıb atəşə atdı, sonra isə qəlblərindəki iman və təsdiqi bildiyinə görə oradan çıxardı.”

***Ən üstün cihad***

* Bir adam Həsəndən soruşdur: “Ey Əba Saîd! Hansı cihad daha üstündür?" Dedi ki: "Öz nəfsani istəklərinlə etdiyin cihad.”

***Allaha itaət edən və günahlardan qaçınan kimsə***

* Bəkr ibnu Adullahın bu cür dediyini eşitdim: “Güclü olub, gücünü

---

[85] Allah azzə və cəllə qiyamət günü Peyğəmbərimizə (sallallahu aleyhi və səlləm) ümmətin günahkar qullarına bağışlanma diləməsi üçün şəfaət etməyə izin verəcək. (Bax: "Buxari, Tevhid: 36, 37"; Muslim, İman: 322) Həmçinin, digər peyğəmbərlər, salehlər və şəhidlərə də şəfaət etmələri üçün izin veriləcəkdir. Bu əhli sünnətin görüşüdür. Xəvariclər kimi bəzi bidət tayfaları isə şəfaəti inkar edirlər.

Allaha itaətdə sərf edən və ya zəif olub, Allah azzə və cəlləyə günah işləməkdən qaçınan kimsəyə Allah mərhəmət etsin!"

### *Qəfildən yaxalanmaq*

* Bu cür deyərdi: "Qəfildən ölməyən, qəfildən xəstələnər. Elə isə Allahdan qorxun və Rəbbinizin sizi qəfildən yaxalamasından çəkinin."

### *Allah Rəsulunun həsrətindən ağlayan kötük*

* Bu cür deyərdi: "Ənəs ibni Malikin bu cür dediyi rəvayət edimişdir:

'Rəsulullah (sallallahu aleyhi və səlləm) cümə günü belini bir xurma ağacının kötüyünə söykəyərək xütbə verərdi. İnsanlar çoxaldığı zaman onun üçün meşə ağaclarından iki mərtəbəli minbər düzəltdilər. Peyğəmbər (sallallahu aleyhi və səlləm) onun üzərinə çıxanda həmin kötük onun həsrətindən inildədi.' Ənəs dedi ki:

'Kötüyün dəvə iniltisi kimi inildədiyini eşitdim. Peyğəmbər (sallallahu aleyhi və səlləm) minbərdən enib onu qucaqlayana kimi inildəməyə davam etdi, sonra isə sakitləşdi.'[86]

Həsən əl-Bəsri bu hədisi rəvayət etdiyi zaman ağlayardı. Sonra deyərdi:

"Ey Allahın qulları! Kötük Allah Rəsulunun (sallallahu aleyhi və səlləm) Allahın yanındakı mövqeyinə görə onun həsrətindən ağlayırdı. Allaha and olsun ki, onunla (sallallahu aleyhi və səlləm) qarşılaşmağın həsrətini çəkməyə siz daha çox haqq sahibisiniz."

---

[86] Hədis səhihdir. Bax: Tirmizi, (3627); İbnu Macə, (1414); Əhməd, (1/268)

*Zamanımızdakı insanların halı*

* Bu cür deyərdi: “Sizdən öncə qəlbləri daha parlaq və paltarları daha qoxulu insanlar var idi. Siz isə bu gün onlardan daha yumuşaq dinə və daha qatı qəlbə sahibsiniz.”

* Bu cür deyərdi: “Allah İbni Məsuda rəhmət etsin! Bu sözləri deyərkən sanki sizi görürdü:

‘Zahidləriniz (dünya) istəkli, çalışanlarınız ehmalkar və alimləriniz cahildir.’ ”

* Bu cür deyərdi: “Mən Bədr döyüşünə qatılanlardan yetmiş nəfəri gördüm. Əgər siz onları görsəydiniz, mütləq onların dəli olduğunu deyərdiniz. Əgər onlar sizin xeyirlilərinizi görsəydi, mütləq deyərdilər ki, onların (axirətdə) heç bir payı yoxdur. Əgər onlar sizin şərlilərinizi görsəydilər mütləq deyərdilər ki, onlar hesab gününə iman etməyiblər.”

***Saleh və Allahdan qorxan kimsə ilə evlənmək***

* Deyilir ki, bir nəfər onun qızı ilə evlənmək istədi və onun üçün yüz min dirhəm xərcləmək istədiyini dedi. Qızın anası dedi:

“Onu evləndir. O, qızı nigahlamağa istəklidir və gördüyün şeyi onun üçün xərcləmək istəyir." Həsən dedi:

“Qadının mehrinə yüz min dirhəm xərcləyən adam kibirli cahildir, onunla evliliyi arzulamamaq və qohumluğa can atmamaq gərəkir.”

Onunla evləndirməyi buraxdı və qızını saleh adamla evləndirdi.”

* Bir nəfər onunla istişarə etdi və dedi: “Ey Əbu Saîd! Mənim çox sevdiyim bir qızım var. Dünyanın bir çox yerindən kişilər ona elçi düşdülər. Kiminlə onu evləndirməyi uyğun görürsən?” Dedi ki: “Onu müttəqi olan birisi ilə evləndir, əgər onu sevsə ikram edər, əgər sevməzsə ona zülm etməz.”

***Saleh övlad***

* Onun oğlu olur və yanındakılar onu təbrik edir və deyirlər:

“Sənə bəxş etdiyi şeydə Allah sənə bərəkət versin və sənə verdiyi nemətini artırsın!” Dedi ki:

“Bütün xeyirli işlərə görə Allaha həmd olsun və Allahdan bütün nemətini artırmasını istəyirik. Yoxsul olsam məni yorğun düşürən. zəngin olsam məni qəflətə düşürənə salam olmasın. Göstərdiyim heç bir səylə və həyatdakı heç bir zəhmətimlə razı sala bilmədiyim kimsəyə də salam olmasın. O kimsə ki, vəfatımdan sonra yoxsulluqdan dolayı halına acıyaram, mən isə elə bir haldayam ki, nə onun üzüntüsündən bir hüzn, nə də sevincindən bir sevinc mənə çatmaz.”

***Zahid kimdir***

* Bu cür deyərdi: “Rəvayət edildiyinə görə bir camaat Zührinin hüzurunda bir-birlərinə zühddən danışırdılar və o dedi:

“Zahid, haramın onun səbrinə və halalın onun şükrünə üstün gəlmədiyi kimsədir.”

*Allahdan və Onun əzabından qorxmaq*

* Bu cür deyərdi: “Kim Allahdan qorxarsa, Allah da hər şeyi ondan qorxudar. Kim də insanlardan qorxarsa, Allah da onu hər şeydən qorxudar.”

* Bu cür deyərdi: “Haqq acıdır, ona yalnız gözəl aqibəti bilən səbr edər. Kim (axirət) savabını umursa, əzabdan qorxar.”

* Bu cür deyərdi: “Mən elə insanlarla qarşılaşdım ki, onlardan birinə halal bir şey ərz ediləndə deyərdi: ona ehtiyacım yoxdur, qorxuram ki, o məni ifsad edər.”

* Bu cür deyərdi: “Əminliklə qarşılaşana kimi olan qorxun, qorxu ilə qarşılaşana kimi olan əminliyindən daha xeyirlidir.”

*Nemətlərdən dolayı hesaba çəkilmək*

* Bu cür deyərdi: “Allahın quluna bəxş etdiyi elə bir nemət yoxdur ki, ondan dolayı hesaba çəkilməmiş olsun. Yalnız Süleyman ibni Davuda (aleyhissəlam) verilən nemət bundan istisnadır. Çünki Allah azzə və cəllə buyurmuşdur:

***«Bu Bizim (hesabsız) hədiyyəmizdir. (İstədiyinə) versən də, verməsən də (səndən onlar barəsində) haqq-hesab tələb olunmayacaqdır.»*** **(Sad,39)**”

*İnsanların şərindən əminlikdə olunmaz*

* Ona deyildi ki: “Ey Əba Saîd! Bəzi insanlar sənin məclisinə gələrək səni çətinliyə salmaq üçün sözlərindən xətalar axtarırlar.” O isə belə dedi: “Ey qardaşımın oğlu! Bu barədə heç bir şey səni üzməsin. Mən

nəfsimi cənnət bağçalarına daxil olması, Rəhmana qonşu olması üçün və peyğəmbərlər (aleyhumussəlam) ilə birlikdə olmağa ümidləndirirəm. Nəfsimin insanlardan əminlikdə olması üçün isə heç ümidlənmədim.”

***Gücün çatdığı qədər əməl etmək***

* Bu cür deyərdi: “Şübhəsiz ki, bu din qüvvətlidir, haqq ağırdır, insan isə zəifdir. Sizdən hər biriniz gücü çatdığını götürsün, çünki qul gücündən artıq bir şey ilə öz nəfsini yükləsə, ondan usanmasından və tərk etməyindən qorxulur.”

***Xəstəlik bədənin zəkatıdır***

* Bu cür deyərdi: “Necə ki, sədəqə malın zəkatıdırsa, xəstəlik də bədənin zəkatıdır. (Xəstəlikdən) əziyyət çəkməyən hər bir bədən, zəkatı çıxarılmayan mal kimidir.”

***Bazar insanından din götürülməz***

* Əban ibnu Yəzid əl-Attar dedi ki: “Məscidə Həsən əl-Bəsrinin yanına girdim və dedim:
‘Allah sənə rəhm etsin, namazı qılmısanmı?’
Dedi ki: ‘Xeyr!’
Dedim ki: ‘Bazardakı insanlar artıq namazlarını qılıblar.’
Dedi ki: ‘Dinini bazardakı insanlardan kim götürər?! Əgər malı yaxşı satılarsa namazı gecikdirərlər, əgər satılmazsa namazı ilk vaxtında qılarlar.’ ”

***Bir diyardan başqasına köçmək***

* Bu cür deyərdi: “Ey insan! Vallahi biz yox olub getmək üçün yaradılmadıq, lakin biz daimi olmaq üçün yaradıldıq. Biz sadəcə bir diyardan başqa bir diyara köçürük.”

***Əcəl və ruzi***

* Bu cür deyərdi: “Ey Adəm oğlu! Sən nə əcəlinin önünə keçə bilərsən, nə öz ruzindən aciz qala bilərsən, nə də ki, sənin olmayan ruziyə sahiblənə bilərsən. Bəs nə üçün var gücünlə çalışıb əldən düşürsən? Nəyə görə özünü öldürürsən?”

***Orta din***

* Bədəvinin biri Həsənlə qarşılaşır və ona deyir: “Allah səni doğrultsun! Nə aşırılığa aparmayan, nə də dindən hər hansı bir şeyi əksiltməyən, orta dini mənə öyrət.” Həsən isə dedi: “Ey qardaşımın oğlu! Əgər bunu doğru dedinsə, gözəl etdin. Şübhəsiz ki, işlərin ən xeyirlisi orta olanlarıdır.”

***İşləri təcrübə etmək***

* Bu cür deyərdi: “Kim işləri təcrübə etməzsə, aldanar. Kim haqq ilə mücadilə edərsə, məğlub edilər.”

***Səmimi insan dedikləri ilə əməl edəndir***

* Bu cür deyərdi: “Bu nədir belə, gurultu eşidirəm, ancaq səmimi (insan) görmürəm ?!”

***Beli qıran şeylər***

* Bu cür deərdi: “Üç şey insanın belini qıran şeylərdəndir:

1. İtaət etdiyin zaman səni azdıran imam,
2. Əgər xeyrli bir şey görsə onu gizlədən, şərli bir şey görsə onu yayan qonşu və
3. Sahibinin zövq almadığı aşkar olan yoxsulluq.”

*Yəqinlik və sağlamlıq*

* Bu cür deyərdi: “Rəsulullahdan (sallallahu aleyhi və səlləm) bu cür dediyi rəvayət edilmişdir:

**“Dünyada insanlara yəqinlik və sağlamlıqdan daha xeyrli bir şey verilməmişdir. Onları Allah azzə və cəllədən istəyin.”**[87]

Sonra isə Həsən dedi: “Rəsulullah (sallallahu aleyhi və səlləm) doğru söylədi. Yəqinlə cənnət tələb edilir, yəqinlə atəşdən qaçılır, yəqinlə xoşa gəlməz şeylərə səbr edilir və yəqinlə fərzlər yerinə yetirilir. Sağlamlıqda isə çoxlu xeyir var.”

*Namazı çirkin işlərdən çəkindirməyən insanın halı*

* Bu cür deyərdi: “Kimin namazı onu çirkin və pis işlərdən çəkindirmirsə, onun namazı Allah azzə və cəllədən uzaqlaşdırmaqdan və Allahın (cəllə sənəuhu) yanında nifrətdən başqa bir şeyi artırmaz.”

*Evliliyin çirkin görüləcəyi zaman*

* Bu cür deyərdi: Peyğəmbər (sallallahu aleyhi və səlləm)-dən bu cür dediyi rəvayət edilmişdir:

**“İnsanlarin üzərinə elə bir zaman gələcək ki, onda dolanışıq yalnız günah işləməklə əldə ediləcək. Həmin vaxt evlilik çirkin görüləcək və onun yerini subaylıq alacaqdır.”**

---

[87] Tirmizi, Daâvat: (3558) – bu hədisi Tirmizi Əbu Bəkrdən (Allah ondan razı olsun) qərib hədis olaraq rəvayət etmişdir.

***Camaat və üzlət***

* Bu cür deyərdi: “Camaatda fəzilət varsa, üzlətdə[88] salamatlıq var.”[89]

***Ümidlərin çox çəkməsi ilə imtahan olmaq***

* Bu cür deyərdi: “Keçmişdə insanlar ümidlərinin uzanması ilə imahan olunardılar.”

***Allahın qullarına nazil etdiyi mühim şeylər***

* Həsən bu cür deyərdi: “Allahın qullarına nazil etdiyi elə şeylər var ki, əgər onlar olmasaydı, peyğəmbərlər və Allaha (azzə və cəllə) yönəlmiş qullar dünyadan heç bir şeylə faydalanmazlardı. Onlar: ümid, əcəl və (başa gələnləri) unutmaqdır.”

Aləmlərin Rəbbi olan Allaha sonsuz həmd, sənalar olsun və Onun qulu və elçisi olan Muhəmmədə, onun ailəsinə, əshabına və qiyamətə kimi onlara gözəl şəkildə tabe olanlara salat və salam olsun!

**MAHMUD TALİB** *(25.03.2019/ 18 Rəcəb 1440)*

***

[88] Üzlət inzivaya, xəlvətə çəkilmə, cəmiyyətdən uzaqlaşmaqdır.

[89] Müsəlmanların camaat şəklində birlikdə olmaları və ixtilaf etməmələri, bütün ehtiyaclarını birlikdə yerinə yetirmələri Allahın və Rəsulunun əmridir. Lakin fitnələrin qaynadığı və yayıldığı vaxtlarda öz nəfsini həmin fitnələrdən qorumaq üçün insanlardan uzaqlaşaraq, ibadətlərlə məşğul olması da Allah Rəsulunun müsəlmanlara buyurduğu əmrlərdəndir.

# Mündəricat

Malik ibni Dinar demişdir: "Həsəni (Allah ona rəhmət etsin) öldükdən sonra yuxumda sevincli halda, bəmbəyaz, göz yaşlarının axdığı yerləri parıldayan vəziyyətdə gördüm.
Dedim ki: "Sən ölmədinmi?"
Dedi ki: "Bəli"
Dedim ki: "Ölümdən sonra necə oldu bu hala gəldin? And olsun ki, sən dünyada çox kədərli idin."
Dedi ki: "Vallahi, o kədər bizim üçün salehlərin mənzilinə yolu göstərən bayrağı qaldırdı, biz də onun savabı ilə müttəqilərin yurduna yerləşdik. Allaha and olsun ki, bu Allahın bizə olan lütfündən başqa bir şey deyildir."
Dedim ki: "Ey Əba Səid! Bəs bizə nə etməyi buyurursan?"
Dedi ki: "Axı nə ola bilər ki? Dünyada ən çox kədərli olan insanlar axirətdə ən çox sevinənlərdir."